## RİYAZİYYAT VƏ MEXANİKA ELMLƏRİ



## TEXNİKA ELMLƏRİ

## NATURAL SCIENCES



## MATHEMATICS AND MECHANICAL SCIENCES

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

## HUMANITIES AND SOCIAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/119/9-11

**Rafail Əhmədli**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
fəlsəfə elmləri doktoru
https://orcid.org/0000-0003-0506-3353
ehmedli.rafail@mail.ru
**Lalə Əhmədova**
Azərbaycan İdman Akademiyası
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0002-4531-9168
lala.ahmadova@sport.edu.az

# Mirzə Kazımbəyin dini tədqiqatları (II yazı)

### Xülasə

Məqalədə XIX əsrdə Rusiyanın işğal etdiyi Türk-müsəlman xalqlarına tətbiq olunan məhkəmə-hüquq sistemi və bu sahədə Mirzə Kazımbəyin araşdırmaları - vərəsəlik hüququ, ailə və nigah məsələləri, alqı-satqı qaydaları, müqavilə bağlama qaydaları və s. nəzərdən keçirilir. Onun «Müxtəsərül-vikayət» və «Şəraül-İslam» kimi praktik xarakterli əsərləri, qanunun insanların həyatındakı rolu haqqında düşüncələri araşdırılır.

Eyni zamanda M. Kazımbəyin dini dünyagörüşünü əks etdirən «Bab və babilər» əsərində bu hərəkatının ictimai-siyasi xarakteri, İslam ideologiyasının mahiyyəti, təriqətlər arasındakı mübarizə, dinlərdəki fanatizm, cəhalət və istibdadın xalqların inkişafına vurduğu zərbələr və s. haqqında fikirlərindən bəhs olunur

***Açar sözlər:*** *müsəlman, məzhəb, şəriət məhkəmələri, qanun, «Quran» ayələri*

**Rafail Ahmadli**
Azerbaijan State Pedagogical University
Doctor of Philosophy
https://orcid.org/0000-0003-0506-3353
ehmedli.rafail@mail.ru
**Lala Ahmadova**
Azerbaijan Sports Academy
PhD in Philology
https://orcid.org/0000-0002-4531-9168
lala.ahmadova@sport.edu.az

# Mirza Kazimbay's Religious Studies (II Article)

### Abstract

This article examines Mirza Kazimbay's legal system applied to the turkish-muslim peoples occupied by Russia in the 19th century and his research in this field. It focuses on issues such as inheritance law, family and marriage, buying and selling rules and contract rules. His practical works such as "Mukhtasarul-vikayat" and "Sharaul-Islam" and his thoughts on the role of law in human life are examined.

At the same time, in work "Bab and Babilar", which reflects M. Kazımbay's religious worldview, his views on the socio-political nature of this movement, the essence of Islamic

ideology, the struggle between religious sects, the blows dealt to the development of nations by religious fanaticism, ignorance and tyranny, etc. are discussed.
***Keywords:*** *muslim, sect, sharia courts, law, Quran verses*

## Giriş

Məlum olduğu kimi, XIX əsrdə Çar Rusiyası işğal etdiyi ərazilərdə, o cümlədən də Azərbaycanda Rusiya qanunları əsasında işləyən rəsmi ədliyyə orqanları – məhkəmələrlə yanaşı, nigah və digər ailə məsələləri ilə məşğul olan yerli ruhanilərin apardığı şəriət məhkəmələrinin də fəaliyyəti saxlanılmışdır. Bunu nəzərə alan böyük mütəfəkkir Mirzə Kazımbəy Rusiya müsəlmanlarının sünni məzhəbinin hüquqi fikirlərini araşdıran və əsas müddəalarını özündə əks etdirən, şəriət məhkəmələrini aparan müsəlman hüquqşünas mütəxəssislərin məmnuniyyətlə qarşıladığı məşhur «Müxtəsər-ül-vikayət» adlı əsərini 1845-ci ildə Kazanda çap etdirmişdi.

Bununla yanaşı, Mirzə Kazımbəy Rusiya imperiyası tərkibində şafiilərin sayca o qədər də çox olmadığını nəzərə alaraq 1850-ci illərdən etibarən şiə məzhəbli müsəlmanların hüquqi məsələlərinin öyrənilməsini ön plana çəkmiş, bununla əlaqədar olaraq üç hissədən ibarət məşhur «Şəraül-İslam» («İslam qanunları») əsərini yazmışdır. Bu əsər əsasən Zaqafqaziya şiə müsəlmanları üçün nəzərdə tutulmuşdu.

«Şəraül-İslam» əsəri hələ 1840-cı illərdə Qafqaz canişinliyinin yüksək rütbəli məmurlarının diqqətini cəlb etmiş və onun rus dilinə tərcüməsi Mirzə Fətəli Axundova həvalə edilsə də, ərəb dilinin incəliklərini dərindən bilməyən və mükəmməl dini təhsil almayan M.F.Axundov canişindən xahiş etmişdi ki, bu əsəri Qafqaz Şeyxülislamı və ya şəriət sahəsində geniş bilgiyə malik başqa bir din xadimi izah və şərhlərlə fars dilinə çevirsin və rus dilinə tərcümə fars variantı əsasında hazırlansın. Yerli ədliyyə sistemində «Şəraül-İslam»ın vacibliyini nəzərə alaraq Axundovun bu təklifi qəbul edilmiş və Şeyxülislam Molla Əhməd Səlyaniyə əsəri farscaya çevirmək üçün xüsusi göstəriş verilmişdi. Lakin əsərin tərcüməsi və nəşri baş tutmamış, yalnız aradan 20 il keçəndən sonra bu ağır işin öhdəsindən Mirzə Kazımbəy özü gəlmişdi (Quliyev, 1987, s. 79).

**Tədqiqat**

Mirzə Kazımbəyin müsəlman hüququ məsələlərinə həsr etdiyi üç hissədən ibarət olan «Şəraül-İslam» əsərinin birinci hissəsi girov və ticarət məsələlərinə həsr edilib və «Girov və ticarət haqqında kitab» adlanır. İkinci hissəsi vərəsəlik məsələsinə aid olub «Vərəsəlik haqqında kitab», üçüncü hissəsi isə ailə və nigahdan bəhs edərək «Nigah haqqında kitab» adlanır. Bu əsərin üçüncü hissəsi, yəni «Nigah haqqında kitab» alimin səhhəti ilə bağlı olaraq nəşr olunmamış, əsər əlyazma şəklində qalmışdır. Bu trilogiyada Mirzə Kazımbəy müsəlman hüququnun yaranması, inkişafı, onun mənbələri haqqında geniş məlumat vermiş, Şərq qanunşünaslığının əsas müddəaları olan vərəsəlik hüququ, ailə və nigah məsələləri, alqı-satqı qaydaları, müqavilə bağlama qaydaları, müsəlman hüququna görə hakimin yeri və rolu və s. kimi məsələləri elmi şəkildə şərh etmişdir. Qərbi Avropa tədqiqatçılarının hüquq və qanunvericiliklə bağlı tədqiqatlarına dərindən bələd olan Mirzə Kazımbəy belə bir nəticəyə gəlmişdi ki, “bu tədqiqatçılardan Vormsun, Maknatenin, Perronun, Dossanın və s. əsərlərində bu problem çox səthi tədqiq olunub və onların əksəriyyətinin tədqiqatları birtərəfli aparılıb” (Kazem-Bek, 1985, s. 105).

M.Kazımbəy həm Rusiya İmperiyası tərkibində yaşayan, həm də dünyadakı müsəlman xalqlarının ədalət məhkəməsini təmin etmək üçün vahid qanunvericilik aktlarının yaradılmasının zəruriliyini irəli sürmüş və bu yöndə konkret addımlar ataraq «Şəraül-İslam» və «Müxtəsər-ül-vikayət» kimi İslam hüquqşünaslığına aid fundamental əsərləri rus dilinə tərcümə edərək onlara şərhlər yazıb çap etdirmişdir. Onun yaradıcılığında müsəlman mülkü hüququ və onun sahələri olan nigah və vərəsəlik hüququ mühüm yer tutur. Müəllif ən qədim dövrlərdən başlayaraq vərəsəlik hüququnun inkişaf tarixini tədqiq edərək belə nəticəyə gəlmişdi ki, “qədimdə güclünün hüququ zəiflərin taleyində başlıca rol oynayırdı və insanpərvərlik ideyası bu cəhətdən bəşəriyyətə yad idi… Romalılarda ailənin zəif üzvlərinin hüquqları güclülərin hüquqları ilə sarsılmazdır” (Məlikova, Bayramov, 1984, s. 120).

M.Kazımbəyin fikrincə, pozitiv qanunların olmaması çox vaxt hökumətə ədalət məhkəməsi haqqında şikayətləri eşitməməyə imkan verir. O, göstərirdi ki, bütün məhkəmə qaydasızlığının mənfi

nəticələri mülkü və dini qanunların sıx əlaqəsindən irəli gəlir. Alim belə hesab edirdi ki, qanunlar külliyyatının mövcud olmaması hakimiyyətin özbaşınalığına, ədalətsiz qərarlar çıxarmasına imkan yaradır. Belə bir halda isə şəriət hakimi pisləmir, hökumət də təqib etmir. Mütəfəkkir sonda belə bir qənaətə gəlir ki, mülki və dini qanunların əlaqələndirilməsi ona gətirib çıxarır ki, ruhanilər məhkəmə işlərinin düzgün həllinə mənfi təsir göstərirlər. Mirzə Kazımbəy güclünün və gücsüzün hüququndan danışarkən həm gücsüzlərin güclülərə tabe olduqlarını, həm də qanunun güclülərin tərəfində olduğunu, məhz hüququn güclülərin zəiflər üzərində hakim mövqe tutmalarına kömək etdiyini göstərmişdir. Alim qanunvericiliyin qaydaya salınmasını təkcə vərəsəlik hüququ sahəsində deyil, hüququn digər sahələrində də qanunların məcəlləşdirilməsi tələbini irəli sürür və belə hesab edirdi ki, möhkəm qanunlar külliyyatının olmaması hakimlərin özbaşınalığına şərait yaradır. Şəriət qanunlarının müxtəlif ziddiyyətli şərhi məhkəmə işlərini qanun üzrə deyil, hakimlərin öz əqidəsinə görə həll etməsinə şərait yaradar və ona hər bir kənar şərait təsir göstərə bilər. Beləliklə də hər yerdə, xüsusilə Qafqaz müsəlmanlarının arasında mübahisələrin həllində çoxlu uğursuzluqlar meydana çıxır.

Mirzə Kazımbəyin hazırladığı və 1862-ci ildə Peterburqda çap etdirdiyi «Şəraül-İslam» əsərinin birinci cildi onun İslama dair tədqiqatlarının davamı idi. Əgər məqalələrində daha çox din tarixçisi kimi çıxış edirdisə, bu trilogiyada müsəlman qanunşünaslığının əsas prinsipləri və müddəaları ön plana çəkilmiş, bir İslam hüquqşünası kimi özünü təsdiq etdirmişdir. Alimin hazırladığı bu dini qanunlar toplusunun daha çox praktik əhəmiyyəti var idi. Çünki bu müsəlman qanunlar toplusu müsəlman şəriət məhkəmələri ilə çar ədliyyəsi arasında bir körpü rolu oynayırdı. Fransız elm tarixçisi Qustav Duqanın yazdığı kimi, "Mirzə Kazımbəy müsəlman hüququ və şəriət sahəsində öz əsaslı tədqiqatları ilə böyük şöhrət qazanmışdır" (Azərbaycan jurnalı, 1983, s. 185).

Mirzə Kazımbəy ər və arvadın vərəsəlik hüququndan bəhs edərkən qanunların hüquq bərabərliyi və onların şəriət normalarının düzgün şərh edilməməsi mövqeyindən çıxış edərək göstərmişdi ki, arvadların, qızların və azyaşlı uşaqların vərəsəlikdən məhrum edilməsi ədalətsiz olduğu kimi, həm də şəriət qanunlarına və «Quran» ayələrinə ziddir.

## Nəticə

Ümumiyyətlə, M.Kazımbəyin əsas qayələrindən biri də dinləri və xüsusilə İslam dinini elmi cəhətdən öyrənmək, onu düzgün başa düşmək, onun dünya və müsəlman xalqlarının həyatında oynadığı rolu elmi şəkildə əsaslandırmaq və bu sahədə tədqiqatlarını genişləndirmək idi.

## Ədəbiyyat

1. Azərbaycan jurnalı. (1983). *Azərbaycan jurnalı*, (4).
2. Berezin, I. N. (1872). Aleksandr Kasimoviç Kazem-Bek. *Protokol zasedanii Soveta Peterburgskogo Universiteta*, № 4. Sankt-Peterburg.
3. Əfəndiyev, M. (2006). *Siyasi və hüquqi təlimlər tarixi*.
4. Əhmədli, R. (2012). *Mirzə Kazımbəyin ictimai fikirləri*. Elm.
5. Ələkbərli, F. (2023). *Azərbaycan Türk fəlsəfi və ictimai fikir tarixi (XIX–XX əsrlər). I cild*. Elm və Təhsil.
6. Faruk, T. (1992). *Türkiye edebiyyatı*.
7. Hüseynov, H. N. (2006). *XIX əsr Azərbaycan ictimai və fəlsəfi fikir tarixindən*. Zəkioğlu.
8. Kazem-Bek, M. (1985). *Izbrannıe proizvedeniya*. Elm.
9. Kazem-Bek, M. (n.d.). Otzyv o dissertatsii magistrata Pergasa. *Gosudarstvennıy istoricheskiy arxiv Leningradskoy oblasti*, f.14, op.3, ed. xr.15503, svyazka 1078, 105.
10. Məlikova, M., & Bayramov, B. (1984). *Azərbaycan siyasi-hüquqi nəzəriyyələr tarixi (oçerklər)*.
11. Quliyev, V. (1987). *Mirzə Kazımbəy*. Yazıçı.
12. Rzaev, A. K. (1989). *Muxammed Ali M. Kazem-Bek*. Nauka.
13. Rzayev, A. (1989). *Məşələ dönmüş ömür: Dərbənddən başlanan əzablı yol*.

Daxil oldu: 01.03.2025
Qəbul edildi: 24.06.2025

DOI: https://doi.org/10.36719/2663-4619/119/12-15

**Faidə İsayeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0003-1568-5885
faida.isayeva@mail.ru

# Dilin cəmiyyətdə rolu və əhəmiyyəti

## Xülasə

Dil siniflər və qruplar arasında təbii ünsiyyət və özünüifadə vasitəsidir. O, sistemli cəmiyyətdə intellektual əlaqə vasitəsidir və cəmiyyətdə dil müxtəlif sosial məqsədlərə xidmət edir. Dil mahiyyətcə səslərin və simvolların hərəkətləri, əşyaları və fikirləri çatdırdığı bir ünsiyyət sistemidir. Dilin tarixi minilliklərə gedib çıxır. Dil yazılı deyil, ilk növbədə danışıq dilidir. Lakin çap mediasının inkişafı və çap sisteminin ixtirası elə informasiya itkisi ilə müşayiət olundu ki, insanlar öz əcdadlarının həyat tərzi və düşüncələri ilə bağlı qaranlıqda qaldılar. İnsanlar arasında ünsiyyət forması kimi dildən istifadə etməklə anlaşılmazlıqları aradan qaldırmaq olar.

***Açar sözlər:*** *dil, cəmiyyət, mədəniyyət, ünsiyyət, informasiya*

**Faida Isayeva**
Azerbaijan State Pedagogical University
PhD in Philology
https://orcid.org/0000-0003-1568-5885
faida.isayeva@mail.ru

# The Role and Importance of Language in Society

## Abstract

Language is a natural means of communication and self-expression between classes and groups. It is a means of intellectual communication in a systematic society and in society, language serves various social purposes. Language is essentially a communication system in which sounds and symbols convey actions, objects and ideas. The history of language goes back millennia. Language is not written, but primarily a spoken language. However, the development of print media and the invention of the printing system were accompanied by such a loss of information that people were left in the dark about the lifestyle and thoughts of their ancestors. Using language as a form of communication between people can eliminate misunderstandings.

***Keywords:*** *language, society, culture, communication, information*

## Giriş

Dil fikirləri başqalarına çatdırmaq üsuludur. Müəyyən dərəcədə bunu işarələrdən istifadə etməklə edə bilərik. Məsələn, "hə" demək əvəzinə başınızı tərpətmək və ya "yox" demək əvəzinə başınızı o yana-bu yana yelləmək məlumat çatdırma üsullarından biridir. Dil jest və işarələrdən fərqlənir, çünki o, həm istifadəçi, həm də dinləyici üçün mənalı səslərdən istifadə edir. Nitq şüurlu şəkildə inkişaf edir və buna görə də həzz, qorxu, qəzəb və təəccübün təsiri altında mexaniki və məqsədyönlü şəkildə yaranan emosional hisslərdən fərqləndirilməlidir (Brown, 1983, s. 30). Dil hər kəsin gündəlik həyatda məlumat və vacib arqumentləri başqalarına çatdırmaq üçün istifadə etdiyi ünsiyyət vasitəsidir. Bu halda dili mədəniyyətdən ayırmaq olmaz, çünki dil milləti təmsil edir və dillərdə danışan qrupların münasibəti və ya davranışı ilə sıx bağlıdır. Dilin mədəniyyət reallığını ifadə edən vasitə kimi rolunu belə ifadə etmək olar: 1) Dil mədəniyyətin bir hissəsidir, 2) Dil və mədəniyyət belə fərqli olsa da, çox sıx əlaqədədir, 3) Dil mədəniyyətin güclü təsiri altındadır, 4) Dil

 

insanların mədəniyyətinə və düşüncə tərzinə əhəmiyyətli dərəcədə təsir göstərir. Dilin iki tərəfi var. Biri çatdırmaq istədiyimiz mənaya aid olan daxili cəhət, digəri isə həmin mənanı danışıq tərzi ilə ifadə etməkdən ibarət olan zahiri cəhətdir (Afroogh, 2013).

**Tədqiqat**

Dildə danışarkən zehində düşüncələrin xarici simvolu kimi xidmət edən sözlərdən istifadə edilir. Dil və nitq arasındakı fərq çox vaxt Ferdinand de Saussure ilə əlaqələndirilir, onun "Course de Linguistique Generale" əsəri 1916-cı ildə ölümündən sonra nəşr edilmişdir. Bu fərqi daha əvvəl Puttenham 1589-cu ildə "The Art of English Poesie" kitabında yazmışdı. Onun fikrinə görə, nitq tam şəkildə ümumi anlayışa çevrildikdən və bütöv bir ölkənin və xalqın razılığı ilə qəbul edildikdən sonra ona "dil" deyirlər. Dilin təfəkkür və sosial şüurla əlaqəli olması çox vacibdir. Mario Pie-yə görə, "dil o zaman məqsədyönlü olur ki, digər insanlar tərəfindən başa düşülsün və bütövlükdə cəmiyyət onu mənimsəməyə qərar versin. Cəmiyyət fikrini dəyişsə, linqvistik simvollar dəyişəcək və ya dəyərini itirəcək" (Brown, 1983, s. 36). Dil siqnalları - konkret fikirlərdən tutmuş ən mücərrəd anlayış və ya nəticələrə qədər zehnin real fikirlərinin obyektiv şəkildə təmsil olunduğu fiziki formalardır. Odur ki, dil təkcə paylaşma və çatdırma üsulu deyil, həm də ictimai şüurda ideyaların formalaşması və möhkəmlənməsi üsuludur. Dil cəmiyyətin mülkiyyətidir; cəmiyyətin digər üzvləri ilə ünsiyyət qurur, insanın fiziki və mənəvi həyatında baş verən bütün fəaliyyətlər haqqında məlumat toplayır və məlumatlandırır. İdeya sürətlə inkişaf edir, yeniləşir, lakin dilsiz təfəkkür anlaşılmazdır, dildə ifadə olunan fikirlər qeyri-müəyyən, anlaşılmazdır, varlığın mahiyyətini və təkmilliyini dərk etməyə kömək etmir (Gee, 2014). Dil dəyişikliklərinin inkişaf istiqamətinə təsir edən iki amil var: insanların həyatında baş verən dəyişikliklər və onun inkişaf mərhələsində onun təşkilinin spesifik xüsusiyyətləri. Dilin daxili strukturunda baş verən dəyişikliklər (xüsusən söz və ifadə formasındakı dəyişikliklər) və dilin uzunluğundakı dəyişikliklər (və onun funksional üsullarının inkişafı) və differensiasiya tarixinin münasibətlərindəki dəyişikliklərdə öz əksini tapır. Fonetik və morfoloji dəyişikliklər birbaşa sosial hadisələrlə bağlı deyil. Dilin strukturunda dilin qarşılıqlı əlaqədə olduğu proseslər çox vacibdir. Dil tarixi ilə cəmiyyət arasındakı əlaqəyə cəmiyyətin tarixi inkişafının müxtəlif mərhələlərində dialekt diferensiasiya dərəcəsinin fərqliliyi təsir göstərir (Əhmədov, 2017).

Cəmiyyətin ayrı-ayrı regional vahidlərə siyasi və iqtisadi parçalanması prosesi siyasi və iqtisadi inteqrasiya proseslərindən əvvəl getdikdə, bütün dillər regional dialektlərə bölünür. Digər tərəfdən, cəmiyyətin siyasi və iqtisadi inteqrasiyası proseslərinin ərazi parçalanması və dialekt diferensiallaşması proseslərindən üstün olduğu bir dünyada ədəbi dil sayılacaq vahid ortaq dilin inkişafı mümkündür. Bu gün dünyada 7117 dil var. Müvafiq xalqın formalaşması zamanı milli dilin inkişafı baş verir. Yaşayan (və ya əvvəllər yaşayan) insanların dilləri. Dünyada ən çox danışılan dillər Çin (1,3 milyard ana dili), İspan (485 milyon), İngilis (373 milyon), Ərəb (362 milyon yerli danışan), Hind dili (344 milyon), Benqal dili (234 milyon), Portuqal dili (232 milyon), Rus (154 milyon), Yapon (125 milyon yerli danışan) və Qərbi Pəncabi (101 milyon yerli danışan). Dünyadakı bütün dillər yaxınlığına görə dil ailələrinə bölünür. Hər biri tarixən eyni dilin dialektləri və ya bir dil ailəsinin bir hissəsi olan bir-birinə yaxın dialektlər ailəsindən törəmişdir. İngilis dili Hind-Avropa ailəsindən olan alman sözüdür. İngilis dili ABŞ, Avstraliya, Hindistan, Malta, Cənubi Afrika, Liberiya və Yeni Zelandiyanın rəsmi olaraq tanınan dilidir. İngilis, Çin və İspan dillərindən sonra dünyada ən çox danışılan üçüncü dildir və eyni zamanda Avropa Birliyinin əsas dilidir (Fairclough, 2003). Daimi və həyati tələbat ünsiyyətdir, çünki insanların təbii qüvvələrə qarşı mübarizəsində, əhəmiyyətli fiziki sərvətlər əldə etmək üçün mübarizədə, cəmiyyətin fəaliyyətində uğur qazanmalarında rolu danılmazdır və onsuz inkişaf qeyri-mümkündür. Dilin cəmiyyətdəki mövqeyi yuxarıda göstərildiyi kimi insanın ən yüksək səviyyələrindən biridir. Dil və onun əhəmiyyəti, ünsiyyət, bilik, anlama, təfəkkür kimi məsələlərdə mühüm rol oynayır. Dilin rolu həm fərd, həm də bütövlükdə cəmiyyət üçün həyati əhəmiyyət kəsb edir (Abdi, 2015, s. 21). Dil cəmiyyətdə mərkəzi mövqe tutur və insanların qarşılıqlı əlaqəsinin, mədəniyyətinin və sosial təşkilatının əsas sütunu kimi xidmət edir. Onun rolu sadəcə ünsiyyətdən kənara çıxır və şəxsiyyət və güc dinamikasından tutmuş təhsil və sosial birliyə qədər hər şeyə təsir edir. Dil mədəni kimliyin əsas komponentidir. O, bir cəmiyyətin dəyərlərini, inanclarını, ənənələrini və tarixini daşıyır və mədəni ifadə və davamlılıq üçün bir vasitə rolunu

oynayır. Dil sosial əlaqələrin yaradılmasında və davam etdirilməsində təsirlidir. Ortaq dil icmalar arasında aidiyyət, birlik və həmrəylik hissini gücləndirir (Fairclough, 1992). Dil şəxsiyyətin mühüm hissəsidir və fərdlərin özlərini necə qəbul etdiyinə və başqaları tərəfindən necə qəbul edildiyinə təsir göstərir. İnsanın danışdığı dil(lər) çox vaxt onların mənşəyini, mədəniyyətini və sosial mənsubiyyətini əks etdirir. Dil müəyyən bir sosial, etnik və ya milli qrupa mənsubluğu ifadə edə bilər. O, eyni dili paylaşan insanları birləşdirə, kollektiv şəxsiyyəti gücləndirə və qrup həmrəyliyini təşviq edə bilər. Dil termini dil və təfəkkürün üzvi əlaqəsi və inteqrasiyası, dilin ruhu və təbiəti, dilin və düşüncənin mənşəyi, obyektiv və subyektiv dilin fərqi deməkdir. İnsanlarda yaranan ilk düşüncə dil qabığında yerləşir. Dil olmadan yalnız təfəkkür prosesi baş verəndə danışmaq və düşünmək mümkün deyil. Dil və ideya keçilməzdir və biri digəri olmadan baş verə bilməz. "Linqvistik materialdan və linqvistik təbii maddədən məhrum olan çılpaq düşüncələr mövcud deyil." Təbii ki, məntiqlə həyat təcrübəsi göstərir ki, dil ideyasız mövcud deyil və bu ideya və ya düşüncə linqvistik təbii "materialda" dolayı ifadə olunur, çünki dil fikrin əsl mənasıdır və bu fikir istehsalda təcəssüm olunur, cəmiyyətin əməkdaşlığı və inkişafı, dil böyüməsi və mübarizəsi ilə edilir. İdeyaları ifadə etmək üçün dildən daha təsirli, praktik və rasional üsul yoxdur. Cəmiyyətin sosial-mənəvi mədəniyyətinin inkişafının müəyyən vəziyyətlərində dil ötürmə yolu ilə yeni məna və terminlərlə zənginləşir, buna görə də dil həm fərd, həm də bütövlükdə cəmiyyət üçün mühüm rol oynayır. Elmdə dilin mənşəyi ilə bağlı müxtəlif və ziddiyyətli nəzəriyyələr mövcuddur (Rəhimov, 2021, s. 226-265). Bəzi nəzəriyyələr dilin bir-biri ilə ünsiyyət qurmaq istəyinin nəticəsi olduğunu, digərləri isə bunun bir neçə insanın əvvəlcə özləri, sonra başqaları üçün fikirlərini ifadə etməsinin nəticəsi olduğunu düşünür. Buna görə də dilin yaranması və inkişafı ilə bağlı müxtəlif perspektivlər, modellər və fərziyyələr işlənib hazırlanmışdır. Bu nəzəriyyələr tənqidi şəkildə araşdırılmalıdır. Dil həm də dünyanın bütün sosial qruplarında sosial əlaqənin əhəmiyyətinə görə vacibdir. Dilin əhəmiyyəti onun ünsiyyət prosesində çoxfunksiyalı olmasında görünür. Başqa sözlə, dil cəmiyyətdə müxtəlif rollar oynayır və onun bir funksiyası sosial alət kimi görünür. Dil sosial bir vasitə kimi bütün dünyada insanlarla ünsiyyət qurmaq üçün istifadə olunur. İnsanların qarşılıqlı əlaqəsi sosial təmas şəklində baş verir ki, bu da fikir mübadiləsi aparmaq və fərdlərin bütün ehtiyac və istəklərini ödəmək üçün şifahi əlaqə tələb edir (Süleymanova, 2016, s. 43-45). Dil vasitəsilə insanlar hərəkətləri əlaqələndirir, fəaliyyətləri planlaşdırır və kollektiv səyləri təşkil edir. İstər görüşün təşkili, istər layihə üzərində birgə işləmək, istərsə də ev təsərrüfatını idarə etmək, dil sosial koordinasiya və əməkdaşlıq üçün vacibdir. Dilçilər tərəfindən dilə müxtəlif təriflər təklif edilmişdir. "Dil mahiyyət deyil, formadır" (Chaer, Lyons, 60). Chaer səs sisteminin simvolu kimi dilin mahiyyətini təşkil edən xüsusiyyətləri ixtiyari, məhsuldar, dinamik, müxtəlif və humanist xüsusiyyətlər kimi qruplaşdırmışdır. Dil sabit və redaktə edilə bilən komponentlər toplusundan ibarət sistemdir. Sistem dedikdə, dilin təsadüfi və ya özbaşına deyil, müəyyən nizama uyğun təşkili nəzərdə tutulur (Khursheed, 2010). Sistemli qrammatika və sintaksis mənalı cümlələr qurmaq üçün lazım olan strukturu təmin edir. Bu struktur natiqlərə sözləri aydın və dəqiq məna ifadə edən şəkildə birləşdirməyə imkan verir, mürəkkəb ünsiyyəti mümkün edir. Sistemli dil, sözlərin və cümlələrin necə qurulacağına dair aydın qaydaları təmin etməklə qeyri-müəyyənliyi azaltmağa kömək edir. Bu aydınlıq, xüsusilə hüquq, elm və təhsil kimi mürəkkəb və ya formal kontekstlərdə effektiv ünsiyyət üçün vacibdir. Sistematik dedikdə, dilin vahid sistem deyil, əksinə, digər dillərdən fərqlənən bir çox alt sistemlərdən ibarət olması nəzərdə tutulur. Dil altsistemləri fonologiya, morfologiya, sintaksis və leksikadan ibarətdir (Quliyev, 2019).

## Nəticə

Dil insanın təhsil səviyyəsini əks etdirir. Savadlı insan təhsilsiz insanlardan daha yaxşı xatırlanır. İnsanın savadı nə qədər yüksəkdirsə, nitq müdrikliyi də bir o qədər çoxdur. Səlahiyyəti göstərir. Lider tabeliyində olanları mükafatlandırmaq üçün yaxşı danışmağı bacarmalıdır. Bu, insanın dilə yiyələnməsi ilə bağlıdır, əgər lider yaxşı danışa bilirsə, o, öz fikirlərini aydın və başa düşülən şəkildə ifadə edə bilər ki, bu da rəhbərin nüfuzunu göstərir. İnsanın sosial vəziyyətini göstərir. Dillə

insan cəmiyyətdəki mövqeyini əks etdirə bilir. Bu səbəbdən də dil müxtəlifliyi yüksək olan və yaxşı ünsiyyət qura bilən insanlar cəmiyyətdə imtiyazlı hesab olunurlar.

## Ədəbiyyat


1. Abdi, A. A., Shultz, L., & Pillay, T. (Eds.). (2015). *Decolonizing global citizenship education*. Sense Publishers.
2. Afroogh, M. R. (2013). *Grammar is the heart and basis of language teaching and learning: English grammar and its role in ELT*. Tehran: Al-Maktoum Publishing.
3. Brown, G., & Yule, G. (1983). *Discourse analysis.* Cambridge University Press, 20-40.
4. Əhmədov, S. (2017). *Qlobal vətəndaşlıq: nəzəriyyə və praktikada*. Elm və Təhsil.
5. Əzizov, C. (2015). *Diskurs analizi: nəzəriyyə və tətbiq*. Nurlan.
6. Fairclough, N. (1992). *Discourse and social change*. Polity Press, 45-70.
7. Fairclough, N. (2003). *Analysing discourse: Textual analysis for social research.* Routledge, 112-130.
8. Gee, J. P. (2014). *An introduction to discourse analysis: Theory and method*. Routledge, 112-140.
9. Khursheed, I. (2010). *The role of language in society*. Oxford University Press, 33.
10. Quliyev, A. (2019). *Təhsil diskursunda leksik və qrammatik vasitələrin rolu*. Elm və Təhsil.
11. Rəhimov, M. (2021). *Qlobal vətəndaşlıq və onun təhsil sahəsində tətbiqi*. Təhsil Nəşriyyatı.
12. Süleymanova, E. (2016). *İngilis dilinin tədrisi: metodika və problemlər*. Təhsil.


Daxil oldu: 27.02.2025
Qəbul edildi: 30.06.2025

DOI: https://doi.org/10.36719/2663-4619/119/16-21

**Vüsalə Qaziyeva**
Bakı Slavyan Universiteti
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0002-0484-676X
vusalagaziyeva73@gmail.ru

# M. Y. Lermontovun "Zəmanəmizin qəhrəmanı" romanında psixologizm aspektləri

### Xülasə

Bu işdə M.Y.Lermontovun «Zəmanəmizin qəhrəmanı» romanında psixologizm anlayışına və onun əsərdəki roluna diqqət yetirilir. Əsərdə şəxsiyyətin daxili dünyasının, psixoloji vəziyyətlərinin və ruh halının dərin və çoxqatlı təsviri vasitəsilə müəllif insan psixologiyasını və daxili mübarizəsini geniş şəkildə araşdırır. Romanın qəhrəmanı Peçorin vasitəsilə psixologizmin ədəbiyyatda yeni bir səviyyəyə yüksəlməsi, şəxsiyyətin daxili aləminin və ruh halının detallı və real şəkildə təqdim olunması göstərilir. Bu işdə psixologizmin əsərdəki funksiyası, onun fəlsəfi və ədəbi məzmunu, eləcə də şəxsiyyətin daxili dünyasının təhlili əsas mövzulardan biri kimi nəzərdən keçirilir. Nəticədə, «Zəmanəmizin qəhrəmanı» romanında psixologizm yeni bir mərhələ açır və insan ruhunun dərinliklərinə səyahət üçün zəngin imkanlar yaradır.

***Açar sözlər:*** *rus ədəbiyyatı, psixologizm, şəxsiyyət problemi, təhlili yanaşma, fəlsəfi analiz*

**Vusala Gaziyeva**
Baku Slavic University
PhD in Philology
https://orcid.org/0009-0002-0484-676X
vusalagaziyeva73@gmail.ru

# Aspects of Psychologism in M. Y. Lermontov's Novel "A Hero of Our Time"

### Abstract

This study focuses on the concept of psychologism and its role in M. Y. Lermontov's novel *A "Hero of Our Time"*. Through the deep and multi-layered depiction of the protagonist's inner world, psychological states, and emotional experiences, the author explores human psychology and internal conflict in a comprehensive way. Using the character of Pechorin, the novel demonstrates the elevation of psychologism to a new level in literature, presenting the individual's inner world and emotional state in a detailed and realistic manner. This work examines the function of psychologism in the novel, its philosophical and literary content, as well as the analysis of the individual's inner world as one of the central themes. As a result, "*A Hero of Our Time*" marks a new stage in the development of psychologism, offering rich opportunities for exploring the depths of the human soul.

***Keywords:*** *Russian literature, psychologism, the problem of personality, analytical approach, philosophical analysis*

### Giriş

M.Y.Lermontovun «Zəmanəmizin qəhrəmanı» romanında diqqət çəkən məqamlardan biri odur ki, «tarixi insanın gözü ilə qiymətləndirmək» prinsipi ilk dəfə rus ədəbiyyatında məhz M. Y. Lermontovun romanında özünü göstərmişdir. Əgər rus realizm ədəbiyyatının 40-cı illərində əsas diqqət cəmiyyətin və ictimai şəraitin insanı deformasiya edən, insan şəxsiyyətini pozan tərəflərinə

 

yönəlmişdisə, romantizm dövründə isə M. Y. Lermontovda əsas diqqət şəxsiyyətə yönəldilir. Bu şəxsiyyət cəmiyyətdən və mühitdən təsirlənir, onlara qarşı çıxır və dünyaya iradəsinin azadlığı üçün öz haqqını tələb edir.

M.Y.Lermontovun «Zəmanəmizin qəhrəmanı» əsərinin əsas mövzusu – insan şəxsiyyətinin taleyi, onun ruhani həyatı, ictimai fəaliyyəti və psixologiyasıdır. Şəxsiyyətin daxili dramını açmaq romanın mərkəzində dayanır. Ancaq bu, yeganə məqsəd deyil. Yazıçı öz qəhrəmanının ruhunu dərin psixoloji analiz etdikdən sonra onun fəlsəfi ümumiləşməsinə keçir və insanın kainatda yerini və məqsədini müəyyən edir.

Tədqiqat: M.Y.Lermontovun təhlili yanaşması şəxsiyyət məsələsində realistik romanda daha da dərinləşir. Bu əsərdə yazıçı yalnız şəxsiyyətin özünəqəsd və üsyanını təsvir etməklə kifayətlənmir, həm də bu məsələyə dərin psixoloji, sosial və fəlsəfi analiz verir. «Zəmanəmizin qəhrəmanı» əsərində M.Y.Lermontov şəxsiyyətin psixologiyasını fəlsəfi səviyyədə anlamağa çalışır. Buna görə də, İ. Vinogradov tam haqlı olaraq romanı «fəlsəfi roman» adlandırır (Dolinina, 1975, s. 13). Alim bu fikri romanın sonuncu hissəsi olan – «Fatalist» əsərinin analizi ilə əsaslandırır və sübut edir. Bu hissə M.Y.Lermontovun şəxsiyyət, iradənin azadlığı haqqında bütün fəlsəfi düşüncələrinin yekunu sayılır. M.Y.Lermontovun sosial-psixoloji xarakterologiyasının aspekti yalnız qəhrəmanın xarakterinin görünən, xarici və determinizmlə müəyyən olunmuş tərəfidir. Əsas qəhrəmanın görünməz fəlsəfi aspektləri isə çox dərinlərdə gizlidir. Romanın səhifələrində Peçorin xarakteri və davranışlarının fəlsəvi-psixoloji analizi baş verir.

**Tədqiqat**

Beləliklə, Peçorinin xarakterinin dialektik inkişafı psixoloji analizdən fəlsəfi analizə doğru gedir. Daha da dərinləşərək, romanın sonuncu hissəsində psixoloji analiz həqiqətən fəlsəfi analizə çevrilir. «Fatalist»dən əvvəl isə, bütün roman boyunca qəhrəmanın öz təcrübəsində iradənin azadlığı xüsusiyyətini həyata keçirməsinin paradoksu və ziddiyyətləri təsvir olunur. Peçorin hələ də fəaliyyət və ruh halı baxımından təsvir edilir. Bu bölmələr oxucuda çoxsaylı suallar doğurur: Peçorin kimdir, onun şübhələrinin və narazılığının səbəbləri və kökləri nələrdir? Bu sualların çoxuna M. Y. Lermontov «Fatalist»də cavab verir (Asmus, 1996).

M. Y. Lermontovun realizm romanında şəxsiyyət, özünü təsdiq etməyə çalışan bir varlıqdır. Peçorin, özünü təsdiq etmədən, heç nə elan etmədən dünyaya dürüst və obyektiv baxa bilmir. Öz şəxsiyyətini itirməmək üçün qəhrəman cəmiyyətin hamılıqla eyniləşdirən, şəxsiyyəti yox edən təsirlərinə qarşı mübarizə aparmalıdır. Qəhrəmanın şəxsiyyəti, onun həyatın mənasını axtarışı, özünü tənqid etməsi və həyat doluluğu ilə fərqlənir. Qəhrəman ətraf dünyası ilə, öz-özü ilə, cəmiyyətin diktə etdiyi normalar və prinsiplərlə daimi ziddiyyət içindədir. M. Y. Lermontov Peçorini təsvir edərkən onun şəxsiyyətinin ziddiyyətli ruh halını göstərməkdə qeyri-adi incəlik əldə edir. O, qəhrəmanının ruhundakı polar güclərin dinamik vəziyyətini dəqiq təsvir edir. M. Y. Lermontov Peçorini ən dəf edilməz ehtirasları, onun xarakterinin ziddiyyətlərinin kəskin ifadələrində təsvir etmişdir.

"Zəmanəmizin qəhrəmanı" romanının ideya mərkəzi məhz şəxsiyyətdir, onun ruhsal və zehni həyatıdır. Qriqoriy Aleksandroviç Peçorin – müstəsna iradəyə malik bir şəxsiyyətdir ki, o, ətrafdakı dünyanı qəbul etmir və ona qarşı öz azadlığını, iradəsini, şəxsiyyətini qoyur. Qəhrəmanın cəmiyyətlə münaqişəsinin başlanğıcı və səbəbi onun cəmiyyət üzərindəki üstünlüyünü dərk etməsidir. Peçorin, parlaq bir şəxsiyyət olaraq, ictimai rəyin və cəmiyyətin simpatiyalarının mövcud çərçivələrinə sığmır. O, onda olan gücləri və qabiliyyətləri hiss edir. Amma bunları mövcud ictimai münasibətlər sistemində həyata keçirə bilmir. Şəxsiyyət öz dövründən, mühitindən yüksəkdir. Belə bir şəxsiyyətin gücü çıxış yolu tapmadıqda, dağıdıcı qüvvəyə çevrilir, bu da bütün ənənəvi davranış normalarını, cəmiyyətin etik normalarını pozur və beləliklə özünü – bu gücün daşıyıcısını da məhv edir. Peçorin yalnız ətrafına deyil, özünə də saysız fəlakətlər gətirir. Dünyaya qarşı mübarizə özünə qarşı mübarizəyə çevrilir, dünyadan narazılıq özündən narazılıqla bitir, başqalarının həyatına laqeyd yanaşma öz həyatına laqeyd yanaşmanı istisna etmir. O, yalnız cəmiyyətlə deyil, həm də özü ilə hesablaşır. Cəmiyyət və dövr şəxsiyyətdən daha mühafizəkardır. Şəxsiyyətin inkişafı həmişə cəmiyyətin inkişafını qabaqlayır. Buna görə Hegel bütün dahi insanların taleyinin faciəli olduğunu

düşünürdü, çünki onlar qaçılmaz olaraq dövr və cəmiyyətlə, mövcud olan ənənəvi dünya görüşləri ilə münaqişəyə girirlər.

M. Lermontovun romanı Fransız psixoloji nəsrinin nümunələri ilə əlaqəsini ortaya qoyur və onun ən yaxşı ənənələrini davam etdirir. İradəli şəxsiyyət problemi Senankurun "Oberman", B. Konstantın "Adolf", Şatobrianın "René", A. Müsse'nin "İkincilərin Etirafı" kimi əsərlərdə işıqlandırılmışdır. Bu əsərlərdə "Zəmanəmizin qəhrəmanı"nda olduğu kimi, şəxsiyyət və mühit arasındakı uyğunsuzluq, şəxsiyyətin öz ruhundakı ziddiyyət, onun ikiliyi eynidir.

Başlanğıcda M. Y. Lermontov romanına "XIX əsrin qəhrəmanlarından biri" adını vermişdi ki, bu da A. Müsse'nin "İkincilərin Etirafı" romanının adı ilə aydın bir şəkildə bağlıdır. M. Lermontov romanının mərkəzində isə "dövr uşağı" xəstəliyi ilə yoluxmuş bir tip yox, iradə azadlığına sahib, dövrü ilə mübarizəyə girən dərin bir xarakter açıqlanır (Shevchenko, 1962).

A. Müsse "İkincilərin Etirafı" romanında yazır: "Ağır xəstəliklərimiz iki səbəbdən irəli gəlir: 1793 və 1814 illərindən keçmiş xalq iki yaraya sahibdir. Hər şey, nə varsa, artıq keçmişdədir. Nə olacaqsa, hələ baş verməyib, buna görə də, bizim əzablarımızın izahını başqa bir yerdə axtarmayın" (Merezhkovskiy, 1969, s.16). Əsərin qəhrəmanı M. Y. Lermontov da keçmişdə baş vermiş qəhrəmanlıq hadisələri və 1825-ci ildə baş vermiş faciəli hadisələrin iştirakçıları olan Peçorinlərin atalarının iştirak etdiyi dövrün insanıdır. Öz növbəsində, bu nəsil ulduz saatını gözləmədən, böyük işlərdə gücünü tətbiq etmək imkanına malik olmayıb. Buna görə də, onun içində güclü qüvvələr refleksiya və çıxış yolu olmayan şübhələrə sərf olunur. Ancaq əgər Müsse bu xəstəliyin müalicə olunması imkanına ümid bəsləyirdisə, M. Y. Lermontov başqa bir vəzifə qoyur. Yazıçı deyir: «Amma bundan sonra da düşünməyin ki, bu kitabın müəllifi heç vaxt insanın pis vərdişlərini düzəltmək üçün qürurlu arzu ilə dolacaq... Xəstəlik göstərilib, onu necə müalicə etmək isə artıq Tanrı bilən işdir!» (Merezhkovskiy, 1969, s. 456).

Bu romanda yazıçının çox sayda şəxsi təcrübələri mövcuddur. Burada öz nəslinin xəstəliklərini və pis vərdişlərini anlamağa çalışan peyğəmbər və şahid danışır. Ədalətli şəkildə O. N. Osmolovskiyə görə, M. Y. Lermontov «tam şəxsiyyət tapmağa çalışır, siniflərin dialektikasını və insanın təbii təbiətinin onun davranışına təsirini anlamağa çalışır» (Osmolovskiy, 1981, s. 33). Peçorin çoxşaxəli şəxsiyyətdir. Onun içində «hüdudsuz qüvvələr», həqiqətən ali insan həyatına olan arzu var. Amma o, mübarizə və inkar ruhu ilə doludur. Güclü şəxsiyyət olan Peçorin içindəki boşluğu doldurmaq üçün «cəlbedicilik vasitələrinə» aludə olur. Bu da onun ziddiyyətli və sirrli olmasına səbəb olur.

Artıq Peçorinin xarici görünüşü belə onun ziddiyyətli təbiətindən bəhs edir. Qəhrəmanın gülən zaman gülməyən gözləri, «nevrotik zəiflik» onun dərin kədərini və varoluşunun boşluğunu hiss etdirir. E. Mixaylova tərəfindən düzgün müəyyən edilən kimi, Peçorinin boşluğu və ümidsizliyi – «bu doymaz və amansız axtarışların acı nəticəsidir» (Myusse, 1997, s. 274).

Peçorinin ruhi həyatı çətin və mürəkkəbdir. Onun ruhunda davamlı olaraq həyatın mənası ilə bağlı faciəli suallar səslənir. O, insanların və ya taleyin qarşısında hər zaman güclü bir zövq tapmağa çalışır; bu zövq isə «ruhun hər mübarizədə qarşılaşdığı qeyri-müəyyən, amma güclü həzzidir». Amma eyni zamanda Peçorin yalnız məqsədsiz mübarizə ilə məşğul deyil. Məqsəd olmadan həyat tamlıqdan məhrum olur və ən əsası isə güclü şəxsiyyətin öz xoşbəxtliyinin və həyat missiyasının tamlığını dərk etməsinə mane olur. Peçorin bu məqsəd və mənanı tapmağa çalışarkən uğursuz olur: bəzən elmdə, bəzən sevgidə, bəzən ölümlə oynamaqda axtarır; nəticədə acı gerçəyi qəbul edir ki, bütün həyatı hədər olub (Hegel, 1971).

Yüksək romantik arzular yerini soyuqqanlı reallığa verir; ictimai xidmət ideallarının yerinə şəxsi hüquqların müdafiəsi yaranır. Yenidən romantik əsərlərində olduğu kimi, M. Y. Lermontov azad və qürurlu şəxsiyyəti — şərtləndirici zəncirlərdən azad olan və cəmiyyətlə mübarizə aparan fərdi qarşı qoyur (Solovyov, 1989).

Romanının ilk səhifələrindən etibarən "Bela" povestində M. Y. Lermontov Peçorini Qafqaza köçürür. Qafqaz — azadlıq diyarı, bütün üsyankar qəhrəmanlar üçün sözün həqiqi mənasında vəd olunmuş torpaqdır. Cəsarətlilik, iradənin davamlılığı və «ürəyin doymazlığı» Peçorini dağlılarla yaxınlaşdırır. Təhlükəli və azad olan Qafqaz həyatı, qəhrəmanın enerjisini və iradəsini göstərən bir elementdir. E. Mixaylova qeyd edir: «Peçorin — şəxsiyyətlə cəmiyyət arasındakı disharmonik

münasibətin göstəricisidir; o — dağ cəmiyyətində insanla mühit arasındakı harmoniyanın ziddidir» (Myusse, 1997, s. 242).

Sivilizasiya insan şəxsiyyətinin şərtsizliyini tanıyaraq, insan şüurunu bütün xarici məhdudiyyətlərdən azad edib. Lakin şəxsiyyətin ideala doğru sonsuz arzusunu təsdiqləyərək, sivilizasiya onun əldə olunmasının mümkün olmadığını da göstərmişdir. Sivilizasiyanın bəhrəsi olan Peçorin digərlərinin taleyində fəal, lakin yad və məhvedici qüvvəyə çevrilir. O, sevdiyi dağlı qızını oğurlamaq və onun sevgisini qazanmaq üçün hər şeyə hazırdır. Belanı oğurladıqdan sonra Peçorin öz boşalmış ruhunu gözəl qadının sevgisi ilə doldurmağa çalışır. Ancaq onun sevgisini qazandıqdan sonra bu duyğudan razı qala bilmir, Belanı uzun müddət sevməyi bacarmır. Peçorin başa düşür ki, onun mübahisəli və reflektiv şəxsiyyəti ilə Belanın yumşaq, yaxşı və lakin inkişaf etməmiş insan təbiəti arasında böyük uçurumlar var. Və bu o deməkdir ki, Peçorin "vəhşi" sevgi ilə razılaşmır, ümumiyyətlə, sevgi onu razı edə bilmir. Sevgi şəxsiyyətin ideali və mənası ola bilməz; o, özünü dünyanın əsas maddi qüvvəsi kimi dərk edən şəxs üçün mənalı deyil. Belanın ölümü, iki mədəniyyətin – sivilizasiyanın və təbii həyatın mübarizəsinin qaçılmaz nəticəsi olaraq sonuncunun məhvinə işarə edir (Olridzh, 1975).

V. G. Belinski yazır: «Belanın sevgisi Peçorin üçün şirin içki dolu tam stəkandı ki, o bircə dəfə içdi və içində heç bir damcı qoymadı; amma onun ruhu bir stəkandan çox olan okean istəyirdi ki, hər dəqiqə ondan götürmək mümkün olsun və azalmadan davam etsin...» (Belinskiy, 1985, s. 48).

Peçorinin mürəkkəb psixologiyası və ikili xarakteri onun özündən ayrılmasına və axan həyatla razılaşmamasına imkan vermir. Onun parlaq və titan şəxsiyyəti öz arzuları və hökmü ilə təkdir. Öz varlığının mənasızlığını və absurdluğunu dərk edən qəhrəman həyatın boşluğunu aşmaq üçün yeni yollar axtarır. Soyuq və acı şübhələr Peçorinin şüurunu yeyir. Rasionalizm – onun həyat tərzidir. O, unudulmaq və onu boğan "böyük boşluğu" unutmaq istəyir. Peçorinin qeyri-adi gücü ona ruhən balans gətirmir. İ. Vinogradov yazır: «Peçorin xarakterinin əsas psixoloji "siniri", onun həyatı, təşvişləri və hərəkətləri üçün əsas daxili mexanizmi – fərdilikdir» (Dolinina, 1975, s. 214).

Soyuq və sərt olan Peçorin dünyadakı hər şeydən çox özünə laqeyddir. O, bütün diqqətini özünə cəm edir. Peçorin hesab edir ki, o özü reallığın mahiyyətidir və ondan önəmli heç nə yoxdur. Dünyanın qəfil zəifliyini düşünən qəhrəman şəxsiyyətinin dəyərini təsdiqləməyə çalışır. O, öz üzərində eksperimentlər aparır və özünü dəyərli subyekt kimi yoxlamaq istəyir. Orta əsrlərdə insan yalnız Tanrı varlığının müşahidəçisi idi. Peçorin isə yeni dövr insanı kimi özünü dərk etməyə və özünü təsdiqləməyə çalışır (Mikhaylova, 1957).

Peçorin şəxsi iradəni ilahiləşdirməyə çalışır. Bu da onu təhlükələr və fırtınalara çəkir. M. Y. Lermontov "Taman" əsərində Peçorini qaçaqmalçıların dairəsinə atır. Onlar üçün yeganə qanun şəxsi azadlıqdır. Bu insanlar cəmiyyət normalarını və qanunlarını pozurlar. Peçorin onların sirrinə nüfuz etməyə can atır. Yenidən onun müdaxiləsi insanlara bədbəxtlik gətirir: Undina və Yanko yola salınır, yaşlı qadın tək-tənha qalır, kor uşaq uzun müddət ağlayır. Bu barədə Peçorin gündəliyində yazır: «Mən kədərləndim. Niyə taleyim məni sülhsevər qaçaqmalçıların dairəsinə atdı? Sanki hamar mənbəyə atılmış daş kimi onların sakitliyini narahat etdim...» (Merezhkovskiy, 1969, s. 504).

Bu insanların həyat macərası şəxsin fırtına və narahatlıq axtaran həyatını doldura bilməz. Və qaçaqmalçılarla görüşdən sonra yenidən Peçorinin ruhunda eyni boşluq yaranır. O, qəzəbli şəkildə bildirir: «… Mənim insan sevinci və bədbəxtliyi ilə nə işim var?!» (Merezhkovskiy, 1969, s. 509). Qətiyyətli iradəsi ona həyata məna verəcək məqsəd axtarışındadır. Lakin o, daim narazılıq hissi ilə bu məqsədin axtarışında ümidsizdir.

"Taman" əsəri xronoloji baxımdan romanda təsvir olunan hadisələrin başlanğıcını təşkil edir. Burada Peçorin xarakteri psixologiyasının təhlili ilə deyil, daha çox onun hərəkətləri və davranışları vasitəsilə açılır. Bu hissəni romanın əsas qəhrəmanının xarakterinin hadisə səviyyəsindəki açılışı kimi adlandırmaq olar. "Peçorinin jurnalı" psixoloji, "Fatalist" isə fəlsəfi səviyyələrdə qəhrəmanın xarakteri və şəxsiyyətinin açılmasına aid edilə bilər. "Knyajna Meri" əsərində M. Y. Lermontov Peçorini müasir cəmiyyətdə göstərir. Burada M. Y. Lermontov Peçorin ruhunun daha ətraflı və dərin psixoloji analizini təqdim edir. "Peçorinin jurnalı" – bu, şəxsin özünə qarşı amansız bir hekayəsidir, onun daxili sirrlərini ifşa edir. "Peçorinin jurnalı" – bu, "müdrik bir şəxsin öz üzərindəki nəticəsidir" (Merezhkovskiy, 1969, s. 491). Bu, şəxsin ruh həyatının etirafı və izahıdır. Özünü və

həyatın mənasını, daha doğrusu, mənasızlığını anlamağa çalışarkən Peçorin "öz zəifliklərini və pis vərdişlərini amansızca ortaya qoyurdu" (Merezhkovskiy, 1969, s. 498). Qəhrəman daxili uçurumu aşmağa çalışır. Peçorində bütün ruhi qüvvələrin gərginliyi, əzabları və XIX əsr insanının ürəyindəki daimi ağrı – bütün bu dövrün ictimai və mənəvi dəyərlərinə olan ümumi xəyanət və inamsızlıq nəticəsində yaranmışdır; eyni zamanda, bu mənasız və absurd həyatın qətiyyən məhkumluğu da onun taleyidir. A. Kamyu yazır: «Absurd insanda» – «dərin mənaya inam yoxdur. O, hadisələr üzərində qaçır, isti və heyranedici obrazlar toplayır, sonra isə onları yandırır» (Lermontov, 1984, s. 273). Peçorinin mübarizəsi ümidin olmamasını və şüurlu narazılığı ehtiva edir. N. Dolinina yazır: «Peçorində həm ehtirasların gücü, həm də yaxşılığa meyl var; onun faciəsi odur ki, o, çox vaxt boşa gedən qüvvələrin çox olduğunu dərk edir; o, yalnız öz çatışmazlıqlarından deyil, həm də öz üstünlüklərindən əziyyət çəkir» (Kamyu, 1989, s. 302). Peçorin azadlığı yüksək qiymətləndirir, lakin eyni zamanda bu azadlıqla necə davranacağını bilmir: «Məndə nə var ki?.. Mən özümü haraya hazırlayıram? Gələcəkdən nə gözləyirəm?.. Düzdür, heç nə» (Merezhkovskiy, 1969, s. 558). Ümidsiz insan özünü belə dərk etdikdə, artıq gələcəyə aid olmur. Əbədi azadlıq şanslarını məhv edərək, Peçorin tam sərbəst hərəkət imkanını təsəvvür edir. Çünki əbədi azadlıq və gələcəyə inam yoxdursa, bu insanın mövcud qüvvələrinin artması və şəxsi iradəsinin inkişafı ilə nəticələnir. Öz arzusunu və müvəqqəti zövqünü təmin etmək üçün o, başqa bir insanın taleyi ilə oynaya bilər və onun şəxsiyyətini manipulyasiya edə bilər. Belə psixologiya və qəhrəmanın davranışı bədbəxtliyin hüququ ilə izah oluna bilər. Peçorin mənəvi və ruhi cəhətdən zəifləmişdir. Öz həyatının mənasızlığını hiss edərək başqalarının həyatına da qiymət vermir. Peçorinin insan taleyinə laqeydliyi onun öz həyatı və taleyinə laqeydliyinin nəticəsidir. Özündən ümidsizləşmiş və həyatını heç sayan o, başqalarının həyatına da dəyər vermir. Peçorinin digər insanlara qarşı sərt və amansız münasibəti onun özünə qarşı eyni münasibətin nəticəsidir. O, mənəvi baxımdan ciddi yaralanmışdır. O, yalnız dünyadan deyil, ətrafındakı aləmdən də razı deyil və özü ilə barışmır. Özünü amansızca yargılasa da, başqalarına qarşı mərhəmət göstərmir. Peçorin gündəliyinə yazır: «Mümkündürmü ki, mənim yeganə məqsədim yer üzündə başqalarının ümidlərini məhv etməkdir?» (Merezhkovskiy, 1969, s. 546). Beləcə, Peçorin obrazı ilə şəxsiyyətin iradəsinin azadlığı məsələsini yalnız sosial aspektdə deyil, həm də tarixi inkişafın nəticəsi kimi anlamağa çalışdıq; onu ümumi insan tarixində bir mərhələ kimi qiymətləndirdik. M. Y. Lermontovun insanı ümumi tarixi inkişafın mühüm mərhələlərindən biri kimi qeyd edirik. Peçorin anladı ki, insan öz taleyini müəyyən etməkdə azaddır; lakin bu azadlıq ona baha başa gəlir və tam reallaşa bilməz. Peçorin Tanrının insanın üzərindəki hökmranlığına inanmaq istəmir. Digər tərəfdən fövqəladə qüvvə olan cəmiyyətin, onun taleyini müəyyən etməsini də qəbul etmir. Kosmosun və Tanrının hakimiyyətindən azad olan insan cəmiyyətin hakimiyyəti altına düşür; insanların cəmiyyətlə bağlı asılılığı onların iradəsinin yeni məhdudiyyət formasıdır. Buna görə də M. Y. Lermontovun qəhrəmanı olan insanı sosial determinizmlə sadələşdirmək ədalətli olmazdı. A. S. Puşkindən sonrakı rus ədəbiyyatı M. Y. Lermontov və N. V. Qoqol vasitəsilə ümumi insani və qlobal məsələlər üzərində işləməyə başladı ki, bunlar Tolstoyun və Dostoyevskinin əsərlərində daha dərindən və geniş şəkildə işlənmişdir. Lakin bu dərin fəlsəfi-psixoloji analizlərin başlanğıcı məhz M. Y. Lermontovdan başlamışdır (Vinogradov, 1964).

## Nəticə

M. Lermontov rus ədəbiyyatında psixoloji roman janrının ilk yaradıcılarından biridir. İnsan, onun mürəkkəb daxili dünyası və psixologiyası yazıçının diqqət mərkəzindədir. İncəsənət və ədəbiyyat mövcud olduqca, onun əsas məqsədi insanın təsviridir. Şairin dərin inamına görə, insan öz varlığını tamamlamaq üçün öz vəzifələrində və əməllərində azad olmalıdır. Eyni zamanda, o aydın bilirdi ki, iradə azadlığının qətiyyətlə vurğulanması şəxsiyyəti cəmiyyətdə mövcud olan qəti və etik prinsiplərlə ziddiyyətə salır.

M. Lermontovun şəxsiyyət anlayışı Avropa estetik düşüncəsində və ədəbiyyatında şəxsiyyət məsələsinin təbii və məntiqi davamıdır. Bu fikir Renessans dövründən XIX əsrin ilk yarısına qədər olan dövrdə formalaşmışdır. Yaradıcılığında Lermontov şəxsiyyətin iradə azadlığını qətiyyətlə vurğulamışdır və onu insanın taleyinin əvvəlcədən müəyyən olunması, onun qeyri-şəxsi və ilahi

information on instrumental performance traditions and the art of songsters singing in Azerbaijan is essential for a deeper understanding of this field and its cultural significance.
***Keywords:*** *singing, mugham, music,Azerbaijan, performance*

## Giriş

Bu gün xalq arasında geniş yayılan, müəllifi unudulduğu üçün xalq mahnıları kimi bilinən yüzlərlə xalq mahnısının mütləq yaradıcısı olmuşdur. Bu zəngin mənəvi dəyər nümunələri ümumxalq məhsuluna çevrilərək, hər biri öz-özlüyündə xalqımızın ulu keçmişindən, məişətinə xas xarakterik cəhətlərdən xəbər verir. Bütün bunlar onu söyləməyə əsas verir ki, milli xanəndəlik sənəti ilk növbədə xalq yaradıcılığı ilə bağlı olaraq yaranmağa başlamışdır.

**Tədqiqat**

XVI-XVII əsrlərdə xanəndəlik sənəti, onun inkişafı, bu sənətin nümayəndələri haqqında demək olar ki, heç bir məlumat yoxdur. Günümüzə qədər haqqında məlumatların gəlib çatdığı xanəndələr isə XVI əsrdə yaşayan Hafiz Lələ Təbrizi, XVII əsrdə yaşayan Şirvanidir. O dövrdə yaşayan xanəndələr arasında Naxçıvanlı Muradağanın da adını çəkmək olar. Tarixi məlumatlara görə, Şirvani və Muradağa Osmanlı hökmdarı IV Muradın dəvəti ilə onun sarayına getmiş və burada fəaliyyət göstərmişdir. IV Muradın özü musiqiyə əhəmiyyət verən, onun elmi əsaslarını mənimsəyən istedadlı bəstəkar olmuşdur. Bu, həmin xanəndələrin həqiqətən də Osmanlı sarayı ilə əlaqəli olduğunu söyləməyə imkan verir. Bu haqda eyni zamanda türk musiqisinin tarixini tədqiq edən Murat Salim Tokaçın məqalələrində də danışılır. O yazır: "II Muraddan sonra məktəb hesab edilə biləcək II dövr, tarixdə Körpülər dövrü olaraq da bilinən IV Murad və IV Məhmədin zamanıdır (1623-1687). Eyni zamanda bəstəkar olan IV Murad böyük bəstəkarları yanında saxlamış, dəyərli azəri bəstəkarları İstanbula gətirmiş sənət himayədarı bir padşahdır." (Murat Salim Tokaç, 2018, "XIX. yüzyıla kadar Osmanlı dönemi kent müziğine, nazariyat ve bestecilik yönündeki gelişmelere genel bir bakış", Uluslararası Müzik ve Sahne Sanatları Dergisi / UMSSD, 2(80)). Bu fikir Şirvani və ya Muradağanın da IV Muradın sarayında işləyən xanəndələr olduğunu söyləməyə əsas verir (Abdullazadə, 1996).

Azərbaycan xanəndəlik sənəti XIX əsrdən etibarən daha geniş formada peşəkar sima qazanmağa başlamışdır. Həmin dövrdə yaşayan xanəndələr öz ifaçılıq üslubu ilə qonşu ölkələrdə də məşhur olmuş, milli xanəndəlik sənətində yeni eranın başlanğıcının əsasını qoymuşlar. Belə xanəndələrdən biri də Səttardır.

Xanəndə Səttarın anadan olduğu il haqqında dəqiq məlumat yoxdur. Belə ehtimal edilir ki, o, XIX əsrin 20-ci illərində Cənubi Azərbaycanda, Ərdəbil şəhərində anadan olmuşdur. Səttarın xanəndə kimi yetişməsi toy mərasimləri və bayram şənlikləri ilə bağlı olmuşdur. Ümumiyyətlə, milli musiqinin inkişafında bu kimi mərasimlər yaradıcılıq emalatxanası kimi qiymətləndirilir. Belə ki, yalnız xanəndələr deyil, sazəndələr, müxtəlif alətlərdə mahir ifaçılar, aşıqlar da məhz xalq mərasimlərində formalaşaraq peşəkarlıq qazanmışlar. Səttar da belə sənətkarlardan olmuşdur.

Səttar gənclik illərində din ilə yaxından maraqlanmış və din xadimi olaraq tanınmağı hədəfləmişdir. Lakin ayrı-ayrı məclislərdə söylədiyi xalq mahnıları və muğamlar onun istedadını cilalamış və Səttar bu sahədə peşəkar fəaliyyətə başlamışdır. O, qısa zamanda müxtəlif klassik şairlərin mətnləri əsasında muğamların mahir ifaçısı kimi tanınmışdır. Səttar Sədi, Hafiz və Füzulinin qəzəllərinə müraciət edərək ifaçılığı ilə dinləyiciləri valeh etmişdir. Səttar Məhəmməd şah Mirzənin rəğbətini qazanaraq, bir neçə il onun sarayında fəaliyyət göstərən nadir xanəndələrdən biri olmuşdur (İsazadə, Eldarova, İsmayılzadə, Məmmədov, Zöhrabov, Hüseynli, 1981).

Xanəndə Səttar 20 yaşı olanda Tiflisə gəlmişdir. Onun yaradıcılığının böyük hissəsi bu şəhərlə bağlıdır. Təsadüfi deyil ki, öz sənətkarlığı ilə diqqət cəlb edən Səttar 1847-ci ildə İtaliyadan gəlmiş skripka ifaçısı Malaqollinin konsertində muğam ifa etmişdir. Bu, onun rəsmi dairələrdə də müvəffəqiyyətini təmin etmişdir. Səttar Tiflisdə Qafqaz canişinliyində İran və Türkiyə dövlət adamları üçün təşkil olunan musiqili gecələrdə öz sənətini məharətlə icra edir, əhəmiyyətli konsertlərdə skripka ifaçısı Miller və müğənni Seymur-Şiff ilə eyni səhnəni paylaşır. 1844-cü ildə Tiflisdə İlya Orbelianinin verdiyi ziyafətdə Səttar öz musiqiçi dəstəsi ilə haqqında uzun müddət danışılan

musiqili ziyafət vermişdir. 1860-cı ilin yanvar ayının 4-də isə həmin şəhərdə Səttarın benefisi təşkil olunmuşdur (Azərbaycan milli musiqisinin tədqiqi problemləri. Respublika elmi konfransının materialları, 1992).

Xalq musiqisi incəlikləri və muğam sənətinin sirlərini dərindən bilən Səttarın səs tembri tenor idi. Onun "Zəmin-xarə", "Dəşti", "Rahab", "Şüştər", "Bayatı-İsfahan", "Rast", "Çahargah" kimi çətin və mürəkkəb muğamları böyük məharətlə ifa etməsi dinləyiciləri valeh edərdi. Güclü improvizasiya qabiliyyətinə malik olan Səttarın iştirak etdiyi məclislər gec saatlara qədər davam edərmiş. Səttar dövrün yaradıcı insanları ilə də yaxın əlaqədə olmuşdur. Təsadüfi deyil ki, şair Y. Polonski öz şeirində Səttarın ifaçılıq qabiliyyətini mədh edir, fransız yazıçısı Jül Vern əsərlərində ondan bəhs edir.

Xanəndə Səttarın yaradıcılıq fəaliyyəti Naxçıvanla da bağlı olmuşdur. O, bura Şəki xanının oğlu Süleyman xan Şəkinski ilə gəlmişdir. Bu haqda Nikoloz Barataşvili öz xatirələrində qeyd edir. Ümumiyyətlə, həmin dövrdə Naxçıvanda Kəngərlilər nəslindən olan şairə Qoncəbəyimin şeir məclisləri poeziya, musiqi vurğunlarının daimi ziyarət etdiyi rəngli gecələr olmuşdur. Səttar Qoncəbəyimin şeirləri əsasında musiqi nömrələri oxumuş, hətta bu şeirlər N. Barataşvili tərəfindən gürcü dilinə tərcümə olunmuş və xanəndə bu dəfə onları gürcü dilində səsləndirmişdir.

Tiflisin Nəbatət bağında müsəlman qəbiristanlığında dəfn olunan Səttarın vəfat etdiyi tarix dəqiq məlum deyil. Onun obrazı 1941-ci ildə "Azərbaycanfilm" tərəfindən istehsal olunmuş, görkəmli mütəfəkkir M. F. Axundzadənin həyatından bəhs edən "Səbuhi" filmində yaradılmışdır.

XIX əsrdə xanəndəlik sənəti və muğam ifaçılığının inkişaf perspektivləri Şuşa şəhəri ilə bağlıdır. Təsadüfi deyil ki, bu qədim şəhər "Qafqazın konservatoriyası" adlandırılır. Şuşada əsrlərdən bəri formalaşan ifaçılıq sənəti musiqinin müxtəlif istiqamətlərinin milli zəmində ən yüksək səviyyədə inkişafına birbaşa təsir göstərmişdir. Xanəndəlik sənəti də bu sahələrdən biridir (Azərbaycan musiqi tarixi (I cild), 2012).

XIX əsrdə Şuşada yaşayıb yaradan xanəndələr müasir xanəndəlik məktəbinin ilk təməl daşlarını təşkil etmişlər. Bu xanəndələrdən biri də Xarrat Quludur. Peşəsi xarratçılıq olan Xarrat Qulu müdrik xanəndə, muğam sənətinin mahir təsvirçilərindən biri olmuşdur. Onun fəaliyyəti xüsusilə Şuşada "Məhərrəmlik"lə əlaqədar təşkil olunmuş "Şəbeh" gecələri ilə bağlı idi. Bu məclislərdə muğam üstündə söylənilən ağılar, kədərli mərsiyələr Xarrat Qulunun ətrafında toplaşan ifaçılar tərəfindən oxunurdu. "Şəbeh" gecələri üçün hazırlıq mərhələsi uzun çəkir, Xarrat Qulu isə hazırlıq prosesinə rəhbərlik edərdi. "Şəbeh" gecələrində klassik Azərbaycan şairləri, o cümlədən M.P. Vaqifin şeirləri əsasında muğam parçaları səslənirdi. "Şəbeh" gecələrinin özünəməxsus xüsusiyyətlərindən biri tamaşalarda müxtəlif muğamlardan istifadə olunması idi ki, bu da muğamların ifaçılıq üslubunun təkmilləşməsinə şərait yaradırdı. İfaçılar həmin gecələrdə müraciət olunan muğamları mükəmməl bilməli idilər. F. Şuşinski qeyd edir: "Əgər məclis 'Zabul-Segah' ilə başlanırdısa, ikinci oxuyan 'Mənəndi-Müxalif' ilə başlayır, üçüncü 'Hasar', dördüncü 'Zabul' oxuyardı, yaxud məclis 'Şur' üstündə başlanırdısa, ikinci 'Şur-Şahnaz' deyir, sonra 'Dügah'a keçir, üçüncü 'Şikəsteyi-fars', dördüncü 'Hicaz', 'Əraq' və yaxud 'Sarəng' oxuyurdu." (Şuşinski, F. (1985). Azərbaycan xalq musiqiçiləri. Yazıçı). Göründüyü kimi, bu şəkildə dairəvi ifa mexanizmi yaradılır, hər bir xanəndə öz məharətini ustalıqla nümayiş etdirirdi. Bu da qeyd edilməlidir ki, "Şəbeh" gecələrində təşkil olunan tamaşalar milli teatr və opera sənətinin inkişafına xüsusi təsir göstərmişdir. "Şəbeh" gecələrində hər bir rolu icra edən ifaçılar var idi və onlar tamaşalarda kimi canlandırırdısa, xalq tərəfindən həmin adla çağırılırdı (Azərbaycan musiqi tarixi (II cild), 2017).

1823-cü ildə Şuşada anadan olan Xarrat Qulu xanəndəlik sahəsində xüsusi məktəb formalaşdırmışdır. Bu məktəbdə 70-ə qədər istedadlı gənc xanəndə kimi yetişmişdir. Hacı Hüsü, Məşədi İsi, Şahnaz Abbas, Dəli İsmayıl, Bülbülcan, Keçəçi oğlu Məhəmməd, Cabbar Qaryağdıoğlu Xarrat Qulu məktəbinin yetirmələridir. Xarrat Qulu haqqında M. M. Nəvvab təzkirəsində, Firudin bəy Köçərli isə "Azərbaycan ədəbiyyatı" kitabında danışır, təxəllüsü Yusifi olan Qulunun ifaçılıq məharətindən bəhs edirlər.

Xarratlıq sənətində də ustalıq nümayiş etdirən Xarrat Qulu milli musiqi alətlərinin hissələrini düzəldər, eyni zamanda gözəl şeirlər yazardı. M. M. Nəvvabın təşkil etdiyi məclislərdə onun da şeirləri səslənirdi. Xanəndəlik sənətinin sirlərini yüksək səviyyədə mənimsəyən Xarrat Qulu öz

şagirdlərinə qarşı tələbkar olmuş, onların ifasında muğam dəstgahlarının təmiz, bərraq səslənməsinə nail olmağa çalışmışdır (Bağırova, 2007).

Ümumilikdə Xarrat Qulu tərəfindən təşkil olunan "Şəbeh" gecələri dini mahiyyət daşısa da, fəaliyyəti və tələbələrlə işi ilə o, milli xanəndəlik məktəbinin formalaşması və muğam ifaçılığının inkişafında əhəmiyyətli rol oynamış görkəmli sənətkarlardan olmuşdur. Xarrat Qulu 1883-cü ildə Şuşada vəfat etmiş, bu qədim Azərbaycan şəhərində dəfn olunmuşdur.

Xarrat Qulunun fəaliyyəti milli xanəndəlik sənətində əvəzolunmaz nailiyyətlərə imza atmış xanəndələr nəslinin yetişməsində mühüm vəzifə kimi qiymətləndirilir. Onun milli xanəndəlik sənətinə qazandırdığı görkəmli ustadlardan biri Hacı Hüsü muğam sənəti haqqında ensiklopedik biliyə malik mütəfəkkir sənətkardır. Təsadüfi deyil ki, M. M. Nəvvabın yaratdığı musiqi məclislərində Hacı Hüsü Nəvvabın tərəfmüqabillərindən biri kimi çıxış etmişdir.

Hacı Hüsü 1839-cu ildə Şuşada, Çölqala məhəlləsində elmə və təhsilə əhəmiyyət verən Kərbəlayi Niftalının ailəsində dünyaya göz açmışdır. Açıq fikirli bir insan olaraq tanınan ata, oğlunun da təhsil almasına xüsusi fikir vermiş və onu molla məktəbində oxutmuşdur. Daha sonra Hacı Hüsü təhsilini mədrəsədə davam etdirmişdir. Hacı Hüsünün muğam sənətkarı kimi yetişməsində onun Xarrat Qulu tərəfindən məclislərə dəvət olunmasının xüsusi əhəmiyyəti olmuşdur. Hacı Hüsünün müəllimləri arasında yazıçı Y. V. Çəmənzəminlinin atası, mahir muğam bilicisi Mirbaba Mirabdulla oğlunun da adı çəkilir. Yalnız Şuşa və Azərbaycanın digər şəhərlərində deyil, Yaxın və Orta Şərq ölkələrinin bir sıra şəhərlərində də öz sənətindən yaxşı mənada söz etdirən Hacı Hüsü, 1880-ci ildə İran şahı Nəsrəddinin dəvəti ilə onun oğlunun toyunda çıxış etmiş, şahın xüsusi mükafatını almışdır. Bu məclisdə onu tarzən Sadıqcan və kamança ifaçısı Bağdagül oğlu Ata müşayiət etmişdir (Bünyadov, 1993).

Hacı Hüsü milli muğamların, xüsusilə "Çahargah"ın mahir ifaçısı olmuşdur. Sadıqcanın müşayiəti ilə ilk dəfə şuşalıların qarşısında "Çahargah" muğamı ilə çıxış edən Hacı Hüsü, Xarrat Qulunun təşkil etdiyi məclislərin bəzəyi idi. Hacı Hüsü dövrünün ziyalı insanları ilə ünsiyyətdə olan, şair və poeziya vurğunlarının məclislərində onların şeirləri əsasında muğam söyləyən istedadlı sənətkar idi. Təsadüfi deyil ki, o, Xurşidbanu Natəvanın yaxından tanıdığı xanəndə olmuş, Xan qızının evində keçirilən məclislərdə iştirak etmişdir. Hacı Hüsünün sənətinə heyran qalan dövrün görkəmli xadimləri arasında şamaxılı Mahmud ağa və Məşədi Məlik Mənsurov da olmuşdur. Hətta belə fakt var ki, Qaçaq Nəbi Hacı Hüsünün dəvət olunduğu məclislərin birində onun ifasını dinləmək üçün iştirak etmişdir.

Müəllimi Xarrat Qulunun bir çox mənada yaradıcılıq ənənələrini davam etdirən Hacı Hüsü bütün həyatı boyu dini musiqiyə müraciət etmiş, məscidlərdə azan söyləmişdir. Onun xüsusilə "Segah" əsasında oxuduğu azan Şuşanın Gövhər ağa məscidinə ibadətə yığışan dindarların yaddaşına əbədi həkk olunmuşdur. Hacı Hüsü "Rast", "Şur", "Şüştər", "Mahur" muğamlarını məharətlə oxumuş, "Kürdi" ilə "Şahnaz"ı birləşdirərək özünəməxsus tərzdə "Kürdi-Şahnaz" ifa etmişdir. Bununla da o, özünün yaradıcı simasını büruzə vermişdir. Ümumiyyətlə, Hacı Hüsü bir sıra muğamları bir-birinə qovuşduraraq ifa edər, orijinal muğam improvizasiyası yaradardı. Bu haqda F. Şuşinski yazır: "Hacı Hüsü klassik muğam musiqisinin təkmilləşdirilməsi üzərində işləyərək 'Rast', 'Şur', 'Mahur' və başqa muğamlara yeni-yeni variantlar, guşələr əlavə etmiş, həmin muğamlar əsasında təsniflər və mahnılar yaratmışdır. Hacı Hüsü eyni zamanda bir neçə muğamın yaradıcısı kimi də məşhurdur" (Şuşinski, 1985).

Hacı Hüsü xanəndəlik sənətinin tarixi inkişafı istiqamətində mühüm işləri ilə yadda qalır. Nəvvabın təşkil etdiyi musiqi məclisləri ilə yanaşı, milli xanəndəlik sənətinin inkişafında xüsusi əhəmiyyəti ilə diqqət çəkən Hacı Hüsü Şuşada ilk "Xanəndələr İttifaqı"nın, bəzi məlumatlara görə isə Sadıqcanın müşayiəti ilə ifa etdiyi "Qatar" muğamının yaradıcısıdır. O, öz dövrünün ən məşhur xanəndəsi kimi tanınmışdır.

Hacı Hüsü sadəcə muğam ifaçılığı ilə məşhurlaşmamışdır. O, eyni zamanda xalq musiqisi nümunələri və mahnıların da mahir ifaçısı idi. Onun səsinin ecazkar tembri istənilən mahnıda xüsusi çalarların əldə olunmasına imkan yaradırdı. Hacı Hüsünün ifasında səslənən el nəğmələri nəfisliyi, incəliyi, zərafəti ilə yadda qalırdı. Onun nəfəsinin diapazonu, boğaz texnikası mükəmməlliyi ilə seçilmiş, zəngulələri ifaya xüsusi bəzək vurmuşdur. Oxuduğu muğamlarda Şərqin dahi mütəfəkkir

şairləri Sədi, Hafiz, Ömər Xəyyam, Füzulinin qəzəllərindən istifadə edən Hacı Hüsü güclü improvizasiya imkanları və fərdi yaradıcılıq təxəyyülü ilə muğam sənətində yeni söz və fikirlər çələngi yaratmışdır. Öz sənəti ilə əfsanəvi sima qazanan Hacı Hüsü haqqında el arasında dastanlar, rəvayətlər yaranmışdır. Ömrünün son illərində vətəni tərk edərək Türkmənistanın Aşxabad şəhərində yaşayan Hacı Hüsü burada məhrumiyyətlər içində 1898-ci ildə vəfat etmişdir.

Xarrat Qulu məktəbinin görkəmli nümayəndələrindən biri, Hacı Hüsünün "Xanəndələr Məclisi"nin daimi iştirakçısı olmuş, onun müasiri xanəndə Məşədi İsi özünəməxsus ifa tərzi və səs çalarının rəngarəngliyi ilə seçilmişdir. O, sadəcə xanəndə kimi fəaliyyət göstərməmişdir. Muğam sənəti və Şərq musiqisinin qanunauyğunluqlarını dərindən bilən Məşədi İsi "Xanəndələr Məclisi"ndə fədakar müəllimliyi ilə də diqqət çəkmişdir. Məşədi İsi yorulmadan, böyük zövqlə bu məclisin gənc xanəndələrinə ifaçılıq vərdişləri və muğam sənətinin ifa xüsusiyyətləri haqqında biliklər vermişdir (Həsənova, 2009).

İran şahı Nəsrəddindən sonra 1896-cı ildə taxta çıxan onun oğlu Müzəffərəddin tərəfindən "Şiri-Xurşid" ordeni ilə təltif olunan Xarrat Qulu məktəbinin görkəmli nümayəndəsi Bülbülcan, milli xanəndəlik sənətini layiqincə təmsil edərək onun inkişaf sərhədlərini genişləndirən ustadlardan biridir. Şuşa mühitinin Bülbülcanın bir xanəndə kimi yetişməsində rolu böyükdür. Məşhur xanəndə burada təşkil olunan musiqi məclislərinin daimi iştirakçılarından biri olmuş, öz ifası ilə gənc yaşlarından şöhrət qazanmış və təsadüfi deyil ki, "Bülbülcan" təxəllüsü ilə tanınmışdır.

Əsl adı Əbdülbaqi Kərbəlayi Əli oğlu Zülalov olan Bülbülcan 1841-ci ildə Şuşada anadan olmuşdur. Onun yaradıcılıq yolunda xan qızı Natəvanın Şuşa şəhərinə su çəkilməsi ilə əlaqədar 1873-cü ildə təşkil olunan el şənliklərindəki ifası xüsusi əhəmiyyət kəsb etmişdir. Bu hadisə xanəndənin Şuşa mühitində, Xurşidbanu Natəvanın gözündə mötəbər şəxs kimi tanınmasında mühüm rol oynamışdır. Əbdülbaqi Zülalov Şuşa Humanitar Kollecinin məzunu olmuşdur.

Bülbülcan ifaçılıq sənətində tarzən Sadıqcanın müşayiəti ilə səsləndirdiyi muğam dəstgahları və xalq mahnıları ilə məşhurlaşmışdır. O, usta xanəndə kimi Qarabağ, Bakı, Şirvan, Şəki, Gəncə şəhərlərində tanınmış, məclislərdə hörmətlə qarşılanmış və sənətinə yüksək qiymət verilmişdir. Digər məşhur xanəndələr kimi Bülbülcan da Şamaxılı Mahmud ağanın daimi qonaqlarından biri olmuşdur. Bülbülcan 1875-ci ildən 1905-ci ilə qədər Tiflis şəhərində yaşayaraq burada özünün təşkil etdiyi tar, kamança, yastı balaban, dəf, qoşanağara kimi alətlərdən ibarət ansambl ilə musiqili gecələrdə iştirak etmiş, Sadıqcanla birlikdə xeyriyyə konsertlərində çıxış etmişdir (Həsənova, 2012).

Maraqlıdır ki, XIX əsrin sonunda Tiflis kimi böyük şəhərlərdə tez-tez müxtəlif müəlliflərin əsərləri əsasında teatr tamaşaları hazırlanırdı. Bu teatr tamaşalarının pərdələri arasında isə kiçik konsertlər təşkil olunardı. Konsertlərdə məşhur sazəndə və xanəndələr öz ifaları ilə tamaşaçılara zövq verirdi. Bülbülcan və onun dəstəsi həmin konsertlərdə ən çox arzu olunan musiqiçi qrupu kimi tanınırdı. Təsadüfi deyil ki, 22 iyun 1886-cı ildə səhnələşən M. F. Axundzadənin "Müsyö Jordan və Dərviş Məstəli şah" tamaşasının pərdələrarası antraktlarında Bülbülcan çıxış etmişdir.

Bülbülcan "Çahargah", "Zabul" muğamlarının mahir ifaçısı idi. O, xüsusilə "Hisar", "Müxalif" şöbələrini böyük şövqlə oxuyardı. "Hisar"ın zəngüləli bölmələrində xanəndənin səsi həqiqətən də bülbül zəngulələrini xatırladırdı.

Bülbülcan müəllimlik fəaliyyəti ilə də məşhurluq qazanan sənətkarlardan biri olmuşdur. O, Ü. Hacıbəyli ilə çiyin-çiyinə milli xanəndəlik məktəbinin peşəkar şəkildə formalaşmasında xüsusi rol oynamışdır. Xanəndə uzun müddət 20-ci illərdə fəaliyyət göstərən Şərq Konservatoriyasında müəllimlik etmiş, burada gənc ifaçılara muğam ifaçılığının sirləri və xanəndəlik sənəti haqqında biliklər vermişdir. 1923-cü ildə Ü. Hacıbəylinin dəvəti ilə Türk Musiqi Məktəbində dərs deyən Bülbülcan zəngin bilik və bacarıqlarını xanəndəlik məktəbinin yeni nəsil nümayəndələrinə həvəslə öyrətmişdir. Eyni zamanda muğam sənətinin təbliğatı işlərində də fəallıq göstərən Bülbülcan 1921-ci ildə Azərbaycanın müxtəlif bölgələrində təşkil olunan konsert proqramlarında iştirak etmişdir.

Bülbülcanın ailəsinin digər üzvləri də milli mədəniyyətin inkişafında xüsusi rol oynamışlar. Onun qızı Əzizə xanım, nəvəsi Sona xanım Hacıyeva Azərbaycanın məşhur aktrisaları, qardaşının iki oğlu - Əli və Qəmbər Zülalovlar məşhur opera müğənniləridir. Görkəmli sənətkar 1927-ci ildə Bakıda vəfat etmişdir (Hüseynov, 1988).

Azərbaycanda xanəndəlik sənətinin inkişafında Şirvan xanəndələrinin xüsusi rolu olmuşdur. Bu məktəbin məşhur simalarından biri Mirzə Məhəmmədhəsən İsmayıl oğlu Fələkzadə Şirvani 1851-ci ildə Şamaxıda anadan olmuşdur. O, Mahmud ağanın təşkil etdiyi musiqi gecələrinin daimi iştirakçısı idi. Bu fəaliyyət Mirzə Məhəmmədhəsəni sənətinin mükəmməl ustası kimi yetişdirmişdir. Xanəndəlik sahəsində təcrübə qazanan Mirzə Məhəmmədhəsən Qafqazın bir çox bölgələrində mahir ifaçılığı ilə tanınıb. O, "Şüştər", "Humayun", "Rast", "Mənsuriyyə" muğamlarını özünün ifa məharəti ilə bəzəyib. Öz bacarığı ilə Cabbar Qaryağdıoğlunun dərin hörmətini qazanan Mirzə Məhəmmədhəsən Cabbarla 1888-ci ildə Bakıda Şamaxılı Hacı Əli Abbasın övladlarının toy məclisində tanış olub. Mirzə Məhəmmədhəsən muğamlara seçdiyi mətnlərdə Seyid Əzim Şirvaninin qəzəllərinə üstünlük vermiş, onun şeirinin qüdrəti ilə "Çahargah" muğamını peşəkar şəkildə ifa etmişdir. Ömrünün son illərində görmə qabiliyyətini itirən Mirzə Məhəmmədhəsən 1916-cı ildə yazdığı "Nalə" adlı kitabda həyatının faciəsini işıqlandırıb. Görkəmli xanəndə 1917-ci ildə vəfat etmişdir.

Azərbaycan xanəndəlik məktəbində qadın ifaçılar da uzun illər yaradıcılıq fəaliyyəti ilə dinləyicilərin rəğbətini qazanmışlar. Dövrün ictimai-siyasi təzyiqləri ilə çox vaxt üz-üzə qalan bu sənətkarlar bəzən öz kimliklərini gizli saxlamış, çox vaxt da toy məclislərində kişi paltarları geyinərək iştirak etmişlər. Onlardan biri XIX əsrdə yaşamış ilk peşəkar qadın xanəndə kimi tanınan Mirzə Güllər "Şur", "Mahur-Hindi", "Rast", "Segah", "Heyratı-Kabili", "Bayatı-Şiraz", "Bayatı-Qacar" muğamlarının ifasında kişi xanəndələrdən heç də geri qalmamışdır. Şamaxı musiqi məclislərinin hörmətli iştirakçılarından olan Mirzə Güllər digər bölgələrdə də tanınmışdır. Onun yaradıcılığına Şirvanın məşhur xanəndəsi Mirzə Məhəmmədhəsənin güclü təsiri olmuşdur.

1914-cü ildə Kiyevdə "Monarx-Rekord", "Ekstrafon" səsyazma studiyalarında oxuduğu muğam və mahnıları qrammofon valına yazdıran Mirzə Güllər Sabirabadın Cavad kəndindəndir. Onun anadan olduğu il məlum deyil. Uşaq yaşlarından toy məclislərində qız-gəlinləri öz səsi ilə heyrətləndirən Mirzə Güllər 1890-91-ci illərdə Şamaxıya gələrək peşəkar xanəndə kimi tanınır. Lakin bu hərəkəti nəticəsində ailəsi ondan üz döndərir. Məlahətli səsi və gözəl ifaçılıq məharəti olan Mirzə Güllərin iştirak etdiyi toy məclisləri şən əhval-ruhiyyə ilə müşayiət olunardı. Təsadüfi deyil ki, şərqşünas alim Yusif Ziya Şirvan Mirzə Güllərin 1914-cü ildə iştirak etdiyi Tiflis toylarından biri haqqında danışarkən xanəndənin ustalığından bəhs edir. Əzizə Cəfərzadə isə "Bir səsin faciəsi" romanında Mirzə Güllərin acınacaqlı taleyi haqqında danışır. Onun təxminən 1914-cü ildən sonra vəfat etdiyi güman edilir. Mirzə Güllərin ifasında lentə alınan "Mirzə Hüseyn Segahı" muğamı, "Yeri dam üstə, yeri" xalq mahnısı Dövlət Səs Yazıları Arxivində qorunub saxlanılır.

Azərbaycan xanəndəlik sənətinin inkişafında Bakı məktəbinin nümayəndələrinin əhəmiyyətli rolu olmuşdur. 1883-cü ildə İçərişəhərdə anadan olan Ağa Cəbrayıl muğamların mahir ifaçısı idi. "Rast" muğamının ifasında yüksək peşəkarlıq nümayiş etdirdiyi üçün o, "Rast Ağa Cəbrayıl" olaraq tanınırdı. Ağa Cəbrayıl "Rast"dan əlavə "Bayatı-Şiraz", "Çahargah", "Segah" muğamlarını da ustalıqla oxuyurdu. Ağa Cəbrayıl oxuduğu muğamların mətnində qəzəl olaraq Hafiz və Füzuli poeziyasına müraciət edirdi. Ağa Cəbrayıldan əlavə Bakı xanəndəlik məktəbinin Əbdülqədi Cabbarov, İçərişəhərli Baladadaş, Kor Hacı, Hacı Məlik, Heydər, Müğbil Xiləli, Kərbəlayi Eldar Qalalı, Xəlil kimi məşhur simaları olmuşdur. Baladadaş "Bayatı-Qacar" muğamını gözəl oxuduğu üçün "Bayatı-Qacar Baladadaş" olaraq tanınıb. Kor Hacı isə "Çahargah" dəstgahını ifa etməkdə özünə rəqib tanımayıb (Murat Salim Tokaç).

Azərbaycan xanəndəlik məktəbinin XX əsrin ilk onilliklərinə qədər olan dövrü əhatə edən inkişaf xətti bu sahədə fədakarlıqla, sənət eşqi ilə çalışan qüdrətli sənətkarların yaradıcılığında ən yüksək mərhələsini yaşamışdır. Bundan sonra xanəndələr özlərindən əvvəl yaşamış sənətkarların yaradıcılıq irsini miras almış, sənətdə bu zəngin mənbəyə arxalanmışlar. Azərbaycanda xanəndələr muğam ifaçılığında ensiklopedik biliyə malik olmuş, milli musiqidə folklor vokalın yüksək səviyyədə inkişafını təmin etmişlər. Yaradıcılıqda peşəkarlıq nümayiş etdirən sənətkarlar milli musiqinin digər sahələrinin də inkişafına töhfələr vermiş, sənətlərini bütün yönləri ilə peşəkarcasına təmsil etmişlər. Məhz onların simasında ümumilikdə milli vokal sənəti şaxələnərək özünün evolyusiyasını yaşamış, xanəndəlik sənəti folklor vokal olaraq öz əhəmiyyətini günümüzə qədər qoruyub saxlamışdır.

Azərbaycanda xanəndəlik sənətinə könül verərək, öz ifaçılıq qabiliyyəti ilə əzəmətli yaradıcılıq irsini miras qoyan Malıbəyli Cümşüd, Malıbəyli Həmid, İslam Abdullayev, Məmmədqulu Şuşinski, Çarıqcı Bahadır və başqaları ayrı-ayrılıqda milli mədəniyyət xəzinəmizi zənginləşdirən sənətkarlardır. Digər ustalarla birlikdə bu sənətkarların əməyi nəticəsində Azərbaycan xanəndəlik sənəti yüksək səviyyədə inkişaf edərək, hər dəfə yeni-yeni nailiyyətlərə imza atan sahə kimi formalaşmışdır. Hər bir xanəndə fərqli üslub və ifaçılıq tərzi ilə xalq mahnıları və muğam ifaçılığında yeni mərhələ yaratmış, hər mərhələdə yeni inkişaf istiqamətləri ortaya çıxmışdır. Buna görə də milli xanəndəlik sənətinin inkişafı yolunda fədakar əməyi ilə yadda qalan hər bir sənətkar unudulmazdır. Onların yaradıcılıq yolu təqdirəlayiqdir və xüsusi tədqiqat obyektidir.

## Nəticə

Azərbaycan xanəndəlik məktəbinin olduqca çox sayda nümayəndəsi olub. Məqalədə öz ifaçılığı ilə xanəndəlik sənətində əhəmiyyətli olan və muğam sənətində islahatçı simaları ilə tanınan, səs diapazonu olduqca geniş və ifaçılıq məharəti əzəmətli olan sənətkarlara daha çox yer verilib. Qeyd edilib ki, məhz onların əməyi nəticəsində müasir xanəndəlik sənəti bu qədər möhtəşəm xarakter alıb.

Xanəndəlik sənətinin inkişafında Xarrat Qulu, Xanəndə Səttar, C.Qaryağdıoğlu, Keçəçi oğlu Məhəmməd, S.Şuşinski, X.Şuşinski və başqalarının rolu əvəzolunmazdır. Onlar sələfləri hesab edilən xanəndələrin yolunu sadəcə davam etdirməmiş, muğam ifaçılığına yeni ifadə tərzi və üslub xüsusiyyətləri qazandırmışlar. Məhz Şuşa məktəbinin yetirmələrinin simasında muğamlar artıq fərqli formada ifa olunmağa başlanılıb. Onlar dəstgah halında təqdim olunub, bir sıra muğamlar bir-biri ilə qovuşdurularaq ifa olunmağa başlayıb ki, bu da ifaçıların yaradıcılığına xas islahat xarakterli yeni təmayüllərin meydana gəlməsindən xəbər verir.

## Ədəbiyyat

1. Abdullazadə, G. A. (1996). *Qədim və orta əsrlərin musiqi mədəniyyəti: Tarixi-fəlsəfi təhlil*. Qartal.
2. Azərbaycan milli musiqisinin tədqiqi problemləri: Respublika elmi konfransının materialları. (1992). Azərbaycan (Ü. Hacıbəyov adına BMA).
3. Azərbaycan musiqi tarixi (I cild). (2012). Şərq-Qərb.
4. Azərbaycan musiqi tarixi (II cild). (2017). Elm.
5. Bağırova, S. D. (2007). *Azərbaycan muğamı: Məqalələr, məruzələr, tədqiqatlar*. Elm.
6. Bünyadov, T. (1993). *Əsrlərdən gələn səslər*. Azərbaycan Dövlət Nəşriyyatı.
7. Həsənova, C. İ. (2009). *Üzeyir Hacıbəylinin yaradıcılığında milli musiqinin nəzəri əsasları*. Mars-Print.
8. Həsənova, C. İ. (2012). *Azərbaycan musiqisinin məqamları*. Elm və Təhsil.
9. Hüseynov, R. B. (1988). *Min ikinci gecə*. İşıq.
10. İsazadə, Ə., Eldarova, Ə., İsmayılzadə, R., Məmmədov, N., Zöhrabov, R., & Hüseynli, B. (1981). *Azərbaycan xalq musiqisi: Oçerklər*. Elm.
11. Murat Salim Tokaç. (t.s.). XIX. yüzyıla kadar Osmanlı dönemi kent müziğine, nazariyat ve bestecilik yönündeki gelişmelere genel bir bakış. *Uluslararası Müzik ve Sahne Sanatları Dergisi (UMSSD)*.
12. Şuşinski, F. M. (1985). *Azərbaycan xalq musiqiçiləri*. Yazıçı.

Daxil oldu: 10.03.2025
Qəbul edildi: 01.07.2025

DOI: https://doi.org/10.36719/2663-4619/119/39-42

**Aytən İbrahimova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
https://orcid.org/0000-0002-3529-0883
ayten_edahib@yahoo.com

# Xarici dilin tədrisində təbii yanaşma metodu

## Xülasə

Təbii yanaşma dil öyrənmənin möhkəm nəzəriyyəsinə əsaslandığı üçün həm dil tədqiqatçılarının, həm də praktiklərin diqqətini cəlb etmişdir. Bu yanaşma, insanların dilləri necə öyrənməsi nəzəriyyəsinə əsaslanan dil öyrənmə və öyrətməyə təkamül yolu ilə yanaşmadır. Bu yanaşmanın əsasında duran nəzəriyyə ondan ibarətdir ki, dil mənimsənilməsi yalnız insanlar mesajları eşitdikdə, oxuduqda və başa düşdükdə baş verir. Bu nəzəriyyə öyrənmə və mənimsənmə arasında fərq qoyur, bütün fərdlərin alıcı (mənimsəyən) ola biləcəyini təklif edir, “monitor” anlayışı ilə çıxış edir və dil öyrənməsinə koqnitiv amillərlə yanaşı, affektiv amillərin də təsir etdiyini göstərir.

Təbii yanaşma dərslərində istifadə olunan materiallar mənalı olmalı, real həyatla əlaqəli olmalı və dil öyrənənlər arasında həqiqi qarşılıqlı əlaqəni təşviq etməlidir. Şəkillər, əyani vəsaitlər, diaqramlar, xəritələr, reklamlar, jurnallar anlamanı və ünsiyyəti inkişaf etdirmək üçün faydalı ola bilər. Şəkilli hekayələr, incəsənət və sənətkarlıq, cizgi filmləri, kuklalar xüsusilə kiçik yaşda olan uşaqlar üçün istifadə edilə bilər. Təbii yanaşmada müəllimlərə bir dərs kitabına yapışmaqdansa, real dünyadan orijinal materiallar hazırlamaq və ya uyğunlaşdırmaq tövsiyə olunur. Beləliklə, sinifdə istifadə olunacaq materialların işlənib hazırlanması, seçilməsi və uyğunlaşdırılması təbii yanaşmanı tətbiq edən müəllimin üzərinə yük qoya bilər.

***Açar sözlər:*** *xarici dil, tədris, metod, prinsip, nəzəriyyə*

**Aytan Ibrahimova**
Azerbaijan State Pedagogical University
https://orcid.org/0000-0002-3529-0883
ayten_edahib@yahoo.com

# The Natural Approach Method in Foreign Language Teaching

## Abstract

The natural approach has attracted the attention of both language researchers and practitioners because it is based on a solid theory of language learning. This approach is an evolutionary approach to language learning and teaching based on the theory of how people learn languages. The theory behind this approach is that language acquisition occurs only when people hear, read and understand messages. This theory distinguishes between learning and acquisition, suggests that all individuals can be recipients (acquirers), introduces the concept of the “monitor” and suggests that affective factors as well as cognitive factors influence language learning.

Materials used in natural approach lessons should be meaningful, relevant to real life and encourage genuine interaction between language learners. Pictures, visual aids, diagrams, maps, advertisements and magazines can be useful in developing understanding and communication. Picture stories, arts and crafts, cartoons and puppets can be used, especially with young children. In the natural approach, teachers are encouraged to develop or adapt original materials from the real world rather than sticking to a textbook. Thus, the development, selection and adaptation of materials to be used in the classroom can place a burden on the teacher who adopts the natural approach.

***Keywords:*** *foreign language, teaching, method, principle, theory*

## Giriş

Təbii yanaşma 1970-ci illərin sonu və 1980-ci illərin əvvəllərində Stiven Kraşen və Treysi Terel tərəfindən hazırlanmış dil tədrisi metodudur. Bu, tədqiqatçıların ikinci dilin mənimsənilməsi ilə bağlı araşdırmalarında müəyyən etdiyi "təbii" prinsipləri özündə birləşdirən dil tədrisi təklifi hazırlamaq cəhdi idi. Bu, sinif şəraitində təbii dil mənimsənilməsini təşviq etmək məqsədi daşıyır və bu məqsədlə ünsiyyəti vurğulayır və şüurlu qrammatika öyrənilməsinə və şagird səhvlərinin açıq şəkildə düzəldilməsinin əhəmiyyətini azaldır. Təbii yanaşma ibtidai sinifdən qabaqcıl səviyyəyə qədər olan siniflərdə və bir neçə başqa dildə də istifadə edilməsinə baxmayaraq, T. Terelin ispan dilini öyrətmək təcrübəsindən irəli gəlmişdir. Eyni zamanda o, Cənubi Kaliforniya Universitetində tətbiqi dilçi alim Stiven Kraşen ilə qüvvələrini birləşdirərək, S. Kraşenin ikinci dilin mənimsənilməsinin təsirli nəzəriyyəsinə əsaslanaraq təbii yanaşmanın nəzəri əsaslandırmasını işləyib hazırladı (Bim, 1981). S. Kraşen və T. Terelin təbii yanaşmanın prinsipləri və təcrübələri ilə bağlı birgə bəyanatı onların 1983-cü ildə nəşr olunan "Təbii yanaşma" ("The Natural Approach") kitabında öz əksini tapmışdır. S. Kraşen və Terel ünsiyyəti dilin əsas funksiyası kimi görürlər və onların yanaşması kommunikativ bacarıqların öyrədilməsinə yönəldiyi üçün onlar kommunikativ yanaşmanın nümunəsi kimi təbii yanaşmaya istinad edirlər. Onlar qrammatikaya dilin mərkəzi komponenti kimi baxan Audiolinqval Metod kimi dil tədrisinin əvvəlki üsullarından imtina edirlər (Richards, 2001, s. 179).

**Tədqiqat**

Bundan əlavə, S. Kraşen və T. Terel təbii yanaşmanı ənənəvi yanaşmalar bayrağı altında yerləşdirməklə dil tədrisinə ənənəvi və qeyri-ənənəvi yanaşmalar arasında fərq qoydular. S. Kraşen və T. Terelin fikirlərinə əsasən, ənənəvi yanaşma heç bir məşq və ya qrammatik təhlilə müraciət etmədən kommunikativ situasiyalarda dilin istifadəsinə əsaslanan yanaşmadır. Bu cür yanaşmalar dil tədrisi tarixində bir çox adlarla, o cümlədən birbaşa, analitik, təbii və psixoloji yanaşmalarla adlandırılmışdır (Bim, 1997). S. Kraşen və T. Terel formadan daha çox mənaya, məşqlərdənsə həqiqi ünsiyyətə üstünlük verdiyi üçün təbii yanaşmanın digər kommunikativ yanaşmalara bənzədiyini iddia etmişlər. Nəzəriyyə və araşdırmalar S. Kraşenin dil əldə etmə nəzəriyyəsi kimi adlandırılan dil mənimsəmə baxışlarına əsaslanır (Richards, 2001, s. 181). Beş əsas fərziyyə təbii metodun əsas prinsiplərini ümumiləşdirir. Bu fərziyyələrə qısaca nəzər yetirək.

Mənimsəmə/öyrənmə fərziyyəsi iddia edir ki, bir saniyədə və ya bir müddət ərzində səriştəni inkişaf etdirməyin iki fərqli yolu vardır. Mənimsəmə uşağın dil bacarıqlarını inkişaf etdirməsinin təbii yoludur. Mənimsəmə dili anlamaq və mənalı ünsiyyət üçün dildən istifadə etməklə dil biliyinin təbii inkişafını əhatə edən şüursuz bir prosesə əsaslanır. Öyrənmə isə dil haqqında şüurlu qaydaların inkişaf etdirildiyi bir prosesdir. Bu, bir dilin formaları haqqında ətraflı bilik və eyni zamanda bu bilikləri şifahi şəkildə ifadə etmək qabiliyyəti ilə nəticələnir. "Öyrənmənin" baş verməsi üçün formal tədris lazımdır və səhvlərin düzəldilməsi öyrənilmiş qaydaların inkişafına kömək edir (Brown, 2006).

Monitor fərziyyəsi birinci fərziyyədən irəli gəlir. Natiqin nitqinin mənbəyinin qazanılmış sistem (yəni şüurlu şəkildə öyrənilməmiş) olduğuna inanaraq, şüurlu şəkildə öyrənilən hər şeyin yalnız bir məqsədə - ifadə olunana nəzarət etməyə (və ya düzəltməyə) və kömək etməyə xidmət edir. Monitor hipotezi iddia edir ki, biz ünsiyyət qurarkən özümüzü düzəltmək üçün öyrənilmiş biliyə müraciət edə bilərik, lakin şüurlu öyrənmə (yəni öyrənilmiş sistem) yalnız bu funksiyaya malikdir (Harmer, 2006).

Təbii nizam fərziyyəsi, qrammatikanın (həm morfologiya, həm də sintaksis) mənimsənilməsinin təbii inkişaf prosesi çərçivəsində proqnozlaşdırıla bilən ardıcıllığa əməl etməsinin başa düşülməsindən ibarətdir. Bu qaydanın həm birinci, həm də ikinci dilin mənimsənilməsi üçün doğru olduğu qeyd edilir. Səhvlər təbii inkişaf prosesinin əlamətləridir və mənimsəmə zamanı (ancaq öyrənmə zamanı deyil) ana dilindən asılı olmayaraq öyrənənlərdə oxşar inkişaf xətaları baş verir.

Giriş fərziyyəsi, dilin ən yaxşı şəkildə öyrənənin kifayət qədər miqdarda başa düşülən girişə məruz qalması ilə əldə olunduğu inancına əsaslanır. O, dörd əsas məsələni əhatə edir. Birincisi, fərziyyə öyrənməklə deyil, əldə etməklə bağlıdır. İkincisi, insanlar dili ən yaxşı şəkildə hazırkı

səriştə səviyyəsindən bir qədər kənara çıxan daxiletməni (girişi) başa düşməklə əldə edirlər. S. Kraşen və T. Terelin dediyi kimi: "Alıcı (mənimsəyən) i + 1 ifadəsini ehtiva edən dili başa düşməklə "i mərhələdən (burada i alıcının bacarıq səviyyəsidir) i+1 mərhələsinə (burada i + 1 bəzi təbii ardıcıllıqla i-dən dərhal sonrakı mərhələdir) keçə bilər" (Hüseynova, 2019).

Üçüncüsü, səlis nitq qabiliyyətini birbaşa öyrətmək olmaz; daha doğrusu, o, zamanla, mənimsəyənin girişi dərk edərək linqvistik səriştəsini formalaşdırdıqdan sonra müstəqil şəkildə "üzə çıxır".

Dördüncüsü, əgər kifayət qədər başa düşülən giriş varsa, i + 1 adətən avtomatik təmin olunacaq.

Affektiv filter fərziyyəsi bildirir ki, affektiv filtri aşağı olan öyrənənlər dili daha yaxşı mənimsəyirlər, çünki onlar daha çox qəbul edə bilirlər, onunla daha çox inamla qarşılıqlı əlaqə qururlar və beləliklə, girişi daha yüksək qəbul edirlər (İsmayılova, 2014).

Digər metodlarda olduğu kimi, təbii metodun da təlim məqsədlərinə, tədris proqramına, tədris materiallarına, müəllimlərin və öyrənənlərin roluna diqqət yetirək (İsmayılova, 2012).

S. Kraşen və T. Terel kursun təşkilinə iki nöqteyi-nəzərdən yanaşırlar. Birincisi, onlar dil kursları üçün bəzi tipik məqsədləri sadalayır və bu məqsədlərdən hansının təbii yanaşmanın hədəflədiyi məqsədlər olduğunu qeyd edirdilər. Onlar belə məqsədləri dörd sahə üzrə sadalayırlar (Richards, 2001, s. 184):

1. Əsas şəxsi ünsiyyət bacarıqları: şifahi (məsələn, ictimai yerlərdə elanları dinləmək)
2. Əsas şəxsi ünsiyyət bacarıqları: yazılı (məsələn, şəxsi məktubları oxumaq və yazmaq)
3. Akademik öyrənmə bacarıqları: şifahi (məsələn, mühazirə dinləmək)
4. Akademik öyrənmə bacarıqları: yazılı (məsələn, sinifdə qeydlər aparmaq)

Digər metodlarda olduğu kimi bu metodda da müəllimlərin və öyrənənlərin roluna, istifadə edilən tədris materiallarına diqqət yetirək. Təbii yanaşma siniflərdə izahat, təcrübə və tətbiqdə böyük nəzarət tələb edən müəllimlərin ənənəvi roluna meydan oxuyur. T. Terel iddia edirdi ki, müəllimlər bu üç aspekt üçün bütün məsuliyyəti öz üzərinə götürdükdə, ünsiyyət üçün çox az yer qalır. Buna görə də, təbii yanaşma müəlliminin bələdçi, giriş təminatçısı və fasilitator kimi çıxış etməsini məqsədəuyğun hesab edir (Rambe, 2019). Müəllimdən dilin mənimsənilməsini asanlaşdıran başa düşülən girişi yaratması gözlənilir; affektiv filtrin aşağı olduğu maraqlı, həvəsləndirici, öyrənənlər üçün səmimi və narahat olmayan atmosfer yaratmaq; və müxtəlif qruplar və kontekstlərdə geniş spektrli fəaliyyətləri təşkil etmək (Rodgers, 2009). Bununla belə, dilin mənimsənilməsi üçün əsas məsuliyyət öyrənənlərin üzərinə düşür. Öyrənənlər artıq öyrəndiklərini istifadə edərək nitqlərini harada və nə vaxt təkmilləşdirəcəklərini müəyyən etməlidirlər. Onların rollarının linqvistik inkişaf mərhələsinə uyğun olaraq dəyişdiyi görülür. Bu dəyişən rolların mərkəzində öyrənənin nə vaxt danışacağı, nə haqqında danışacağı və nitqdə hansı linqvistik ifadələrdən istifadə edəcəyi ilə bağlı qərarlar durur (Vannak, 2020).

Təbii yanaşmanın diqqət çəkən digər bir cəhəti səhvlərin düzəldilməsi ilə bağlıdır. T. Terel, xüsusilə nitqdə səhvlərin düzəldilməsinin yalnız dilin mənimsənilməsi üçün faydasız olduğunu deyil, həm də motivasiya və münasibətə mənfi təsir göstərdiyini iddia etdi. Buna görə də o təklif etdi ki, səhvlərin düzəldilməsi yalnız formaya xüsusi diqqət yetirən yazılı tapşırıqlarda aparılmalıdır. T. Terelin fikrincə, şifahi ünsiyyət fəaliyyətləri zamanı səhvlərin düzəldilməsi aparılmamalıdır (Toprak, 2019, s. 130).

## Nəticə

Təbii yanaşma "yeni başlayanlar üçündür və onlara ara səviyyəli olmağa kömək etmək üçün nəzərdə tutulmuşdur." Tələbələrin hədəf situasiyada adekvat şəkildə fəaliyyət göstərə biləcəyinə dair gözləntilərə malikdir. Onlar hədəf dilin danışanını başa düşəcəklər və öz istək və fikirlərini (təhqir etməyən tərzdə) çatdıra biləcəklər.

## Ədəbiyyat

1. Bim, I. L. (1981). *Teoreticheskie osnovy metodiki obucheniya inostrannym yazykam v sredney shkole*. Moskva: Pedagogika.
2. Bim, I. L. (1997). *Kontseptsiya obucheniya vtoromu inostrannomu yazyku (nem. na baze angl.)*. Moskva: Ventana-Graf.
3. Brown, H. D. (2006). *Principles of language learning and teaching* (5th ed.). Pearson Education ESL.
4. Harmer, J. (2006). *How to teach English* (1st ed.). Pearson.
5. Hüseynova, F. (2019). Tədrisdə kommunikativ bacarıqların formalaşmasına dair. *Azərbaycan məktəbi*, 85–89.
6. İsmayılova, A. (2012). Xarici dillərin tədrisində interaktiv metodlar. *Azərbaycan məktəbi*, (6).
7. İsmayılova, A. (2014). Xarici dilin tədrisi metodikasının bəzi istiqamətləri. *Azərbaycan məktəbi*, (5).
8. Rambe, S. (2019). Total physical response. *English Journal for Teaching and Learning*, 7(1), 45–58.
9. Richards, J. C., & Rodgers, T. S. (2001). *Approaches and methods in language teaching* (2nd ed.). Cambridge University Press.
10. Rodgers, T. S. (2009). The methodology of foreign language teaching: Methods, approaches, principles. In K. Knapp & B. Seidlhofer (Eds.), *Handbook of foreign language communication and learning* (pp. 341–372). Mouton de Gruyter.
11. Toprak, T. E. (2019). The natural approach. İzmir: Bakırçay University, School of Foreign Languages, 127–142.
12. Vannak, H. (2020). Natural approach versus communicative approach in ESL classroom.

Daxil oldu: 04.03.2025
Qəbul edildi: 16.06.2025

DOI: https://doi.org/10.36719/2663-4619/119/43-48

**Bahar Gadirova**
Baku Slavic University
PhD student
https://orcid.org/0009-0008-6683-0505
bahar.gadirova@gmail.com

# Oriental Lexicon in the Works of Adam Mickiewicz
## *(On the Objective Reasons Behind This Creative Approach)*

### Abstract

This article analyzes the functional and aesthetic significance of Eastern lexicon in the works of Adam Mickiewicz, emphasizing the role of cultural and historical factors in shaping his romantic-orientalist worldview. The author argues that Mickiewicz approached Eastern culture not merely with exotic curiosity, but through deep scholarly and creative engagement, drawing on Persian and Arabic sources, as well as religious and mythological elements in a distinctly artistic manner. His works—such as *Sonety krymskie* (The Crimean Sonnets), *Aryman i Oromaz*, and *Droga nad przepascią w Czufut-Kale*—feature a rich array of toponyms, sacred terms, mythological references, and everyday vocabulary that reflect this intercultural sensitivity.
***Keywords:*** *East, romanticism, lexicon, orientalism, poetry, creativity*

**Bahar Qədirova**
Bakı Slavyan Universiteti
doktorant
https://orcid.org/0009-0008-6683-0505
bahar.gadirova@gmail.com

# Adam Mitskeviçin yaradıcılığında Şərq leksikası
## (Bu yaradıcı yanaşmanın obyektiv səbəbləri haqqında)

### Xülasə

Məqalədə Adam Mitskeviçin yaradıcılığında Şərq leksikasının funksional və estetik əhəmiyyəti, onun romantik-orientalist baxışlarının formalaşmasında mədəni-tarixi amillərin rolu təhlil olunur. Müəllif göstərir ki, Mitskeviç Şərq mədəniyyətinə sadəcə ekzotik maraqla deyil, dərin elmi və yaradıcı münasibətlə yanaşmış, fars və ərəb mənbələrindən, dini və mifoloji elementlərdən bədii şəkildə istifadə etmişdir. Onun əsərlərində "Sonety krymskie", "Aryman i Oromaz", "Droga nad przepaścią w Czufut-Kale" kimi nümunələrdə toponimlər, sakral anlayışlar, mifoloji və məişət leksikası xüsusi yer tutur. Şairin bu yanaşması təkcə fərdi zövq deyil, həm də dövrün Avropa və rus romantiklərinin ortaq estetik meyllərinin tərkib hissəsi kimi dəyərləndirilir. Mitskeviç Şərqə olan marağını yalnız təsvir vasitəsi kimi deyil, həm də interkultural mətn quruculuğunun əsas elementi kimi təqdim edir. Məqalə həmçinin onun orientalizmə olan münasibətinin Bayron, Höte və digər müasirləri ilə müqayisəsini apararaq, polşa romantizminə xas olan dərin humanist və psixoloji nüanslara diqqət çəkir.
***Açar sözlər:*** *Şərq, romantizm, leksika, orientalizm, poeziya, yaradıcılıq*

### Introduction

Mickiewicz's treatment of the East goes beyond mere decorative function; it represents a core element of intercultural textual construction. This approach is interpreted not only as a manifestation of his personal aesthetic taste, but also as part of the broader set of shared artistic tendencies among European and Russian Romantics of his era. The article also compares

Mickiewicz's orientation toward Orientalism with that of Byron, Goethe and other contemporaries, highlighting the distinctive humanistic and psychological depth characteristic of Polish Romanticism.

The consistent reference by renowned world classics to lexicon borrowed from various languages in their creative works—regardless of degree—has always attracted the interest of literary scholars, linguists, and translation theorists. It should be noted that today, favorable conditions have emerged for the theoretical and practical analysis of the micro and macro components of literary texts, as well as the denotative content of a given work as a whole. From this perspective, the comprehensive philological analysis of various authors' texts serves to reveal their creative strategies on both aesthetic-artistic and purely lexical levels (Mickiewicz, 1998, p. 5).

It is evident that the author's consciousness does not blindly reproduce reality through language; rather, the author selectively composes and integrates events, features, and qualities that hold significance to them, thereby constructing a subjective model of reality shaped by individual thought.

Before identifying the origin or semantic characteristics of a specific literary work or the components of a text created by a prominent master of words, it is essential to consider the objective cultural and historical factors that have influenced their creation. As one scholar notes, "A literary work extends far beyond the boundaries of its text. It is perceived in the context of reality and in relation to it. Cities, villages, nature, historical events, and elements of national daily life all form an integral part of the work and cannot be excluded from its interpretation" (Babenko, Kazarin, 2006, p. 31).

In other words, the expansion of the vocabulary of any given language, including the enrichment of the literary-creative lexicon, is not confined solely to its national lexical resources. It is impossible to ignore the roles of cultural-historical, socio-political, and socio-psychological factors in this objective process. The prominent linguist V. A. Zvegintsev once wrote that when analyzing linguistic processes, one should rely on concrete linguistic facts rather than engage in vague philosophical speculation, which he likened to "sailing in the sea without a compass" (Droga nad przepaścią w Czufut-Kale – A. Mickiewicz, 1899, pp. 191–192).

The cultural histories of world nations demonstrate that this process follows its own patterns. In certain cases, cultural factors may even diverge from or contradict socio-political realities. For example, despite the Akkadians' political and legal conquest of the Sumerians, they remained under the cultural influence of the Sumerians throughout history. A similar situation is observed in the case of Roman civilization, which emerged after Ancient Greece and continued to be deeply shaped by Greek culture.

Of course, in addition to the abovementioned and other unmentioned factors, it is essential not to overlook the writer's inner moral-psychological impulses and the objective demands of creative expression. In this context, the manifestations of the Romantic literary-artistic movement are of particular significance. In the majority of works by European and Russian Romantics, events are typically depicted against the backdrop of the mysterious East. This creative principle becomes especially prominent and purposeful in the literary legacy of artists with an orientalist worldview. A vivid example of this can be found in the oeuvre of Adam Mickiewicz, a powerful representative of Polish Romanticism (Sadykhov, 1975).

**Research**

Polish Romanticism was shaped against the backdrop of the struggle for the independence of a nation that had lost its sovereignty. One of the defining features of this form of Romanticism was the association many of its authors made between the salvation of their homeland and Napoleon's victory. Napoleon's eventual defeat further convinced them that no one else could bear the burdens of their national struggle-they alone would have to fight for their country. Only the children of the homeland could defend it (Aryman i Oromaz – A. Mickiewicz, n.d.).

Adam Mickiewicz, a leading figure in that struggle who endured imprisonment, exile, and persecution, gained exceptional authority among his contemporaries. One of the reasons for this was his openness to the cultures of other nations, particularly the ancient East. Mickiewicz and

Müxtəlif su-bataqlıq quşlarının, ən cox qazkimilərin parazitidir. Birinci aralıq sahibi *Planorbis planorbis, P. umbrilicatus,* ikinci aralıq sahibi *Limnaea staqnalis* şirin su mollyusklarıdır.

*Paryphostomum testitrifolium* Gogate, 1934

Sahibi: iri qarabattaq (28,6%; 1-8 ədəd).

Lokallaşması: bağırsaq.

Qarabattaqların parazitidir.

*Patagıfer bilobus* (Rudolphi, 1819)

Sahibləri: böyük maygülü (50,0%; 3-16 ədəd), kiçik maygülü (55,5%; 2-12 ədəd), iri qarabatdaq (57,1%; 4-12 ədəd), kiçik qarabattaq (40,0%; 2-9 ədəd).

Lokallaşması: bağırsaq.

Balıqyeyən su-bataqlıq quşlarının parazitidir. Nadir hallarda caydaqlılarda, su fərələrində və iyrəncələrdə də təsadüf edilir.

*Petasiger exaeretus* Dietz, 1909– 64

Sahibləri: iri qarabattaq (14,3%; 1-4 ədəd), kiçik qarabattaq (20,0%; 1-2 ədəd).

Lokallaşması: bağırsaq.

Qarabattaqların parazitidir; inkişafında şirin su mollyuskları və balıqlar iştirak edir.

*P. megacantha* (Kotlan, 1922)

Sahibləri: böyük maygülü (37,5%; 2-9 ədəd), kiçik maygülü (33,3%; 1-7 ədəd).

Lokallaşması: bağırsaq.

Maygülülərin parazitidir; inkişafında şirin su mollyuskları və balıqlar iştirak edir.

*P. phalacrocoracis* (Yamaguti, 1939)

Sahibləri: iri qarabattaq (85,7%; 7-29 ədəd), kiçik qarabattaq (80,0%; 4-18 ədəd).

Lokallaşması: bağırsaq.

Qarabattaqların parazitidir; inkişafında şirin su mollyuskları və balıqlar iştirak edir.

*P. skrjabini* Baschkirova, 1941

Sahibləri: böyük maygülü (12,5%; 1-3 ədəd).

Lokallaşması: bağırsaq.

Qazkimilərin və maygülülərin parazitidir.

Fəsilə ECHINOCHASMIDAE Odhner, 1910

*Echınochasmus beleocephalus* (Linstow, 1873)

Sahibləri: iri ağ vağ (37,5%; 2-5 ədəd), kiçik ağ vağ (42,9%; 1-5 ədəd).

Lokallaşması: bağırsaq.

Caydaqlıların parazitidir, bəzən qazkimilərdə də təsadüf olunur; ikinci aralıq sahibləri balıqlar və amfibilərdir

*E. bursicola* (Greplin, 1837)

Sahibləri: Misir vağı (16,7%; 2 ədəd).

Lokallaşması: Fabrisi kisəsi, kloaka, bağırsaq.

Caydaqlıların parazitidir; ikinci aralıq sahibləri balıqlar və amfibilərdir.

*E. coaxatus* Dietz, 1909

Sahibləri: böyük maygülü (25,0%; 3-10 ədəd), kiçik maygülü (22,2%; 2-7 ədəd), iri qarabattaq (57,1%; 3-14 ədəd), kiçik qarabattaq (40,0%; 2-11 ədəd).

Lokallaşması: bağırsaq.

Əsasən maygülülərin parazitidir, bəzən başqa su-bataqlıq quşlarında da təsadüf olunur; birinci aralıq sahibləri qarınayaqlı mollyusklardır.

*E. coronatus* (Mendheim, 1940)

Sahibləri: Misir vağı (33,3%; 1-3 ədəd), iri ağ vağ (50,0%; 2-6 ədəd), kiçik ağ vağ (71,4%; 3-17 ədəd).

Lokallaşması: bağırsaq.

Vağların parazitidir.

*E. dietzevi* Insaltschikov, 1927

Sahibləri: böyük maygülü (37,5%; 1-6 ədəd), kiçik maygülü (44,4%; 1-4 ədəd).

Lokallaşması: bağırsaq.

Mayğülülərin parazitidir, bəzən başqa su-bataqlıq quşlarında da qeyd olunur.

*E. intermedius* Skrjabin 1919

Sahibi: iri ağ vağ (12,5%; 2 ədəd).

Lokallaşması: Fabrisi kisəsi, kloaka, bağırsaq.

Vağların parazitidir.

*Mesorchıs denticulatus* (Rudolphi, 1802)

Sahibləri: gümüşü qağayı (22,2%; 1-2 ədəd), kiçik sterna (20,0%; 1-3 ədəd).

Lokallaşması: bağırsaq.

Qağayıkimilərin parazitidir, məməlilərdə də qeyd olunmuşdur; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri isə balıqlardır.

*M. pseudoechinatus* (Olsson, 1876)

Sahibləri: böyük maygülü (12,5%; 2 ədəd), kiçik maygülü (11,1%; 1 ədəd), bizquyruq (33,3%; 1-3 ədəd), boz qağayı (33,3%; 2-6 ədəd), adi qağayı (57,1%; 1-7 ədəd).

Lokallaşması: bağırsaq.

Əsasən qağayılarda, daha az isə iyrəncələrdə, qazkimilərdə və kürəkayaqlılarda parazitlik edir; birinci aralıq sahibləri qarınayaqlı mollyusklar, ikinci aralıq sahibləri balıqlardır.

*Aporchis massiliensis* Timon-David, 1955

Sahibləri: adi qağayı (14,3%; 1 ədəd), kiçik sterna (10%; 2 ədəd).

Lokallaşması: bağırsaq.

Qağayıların parazitidir, birinci aralıq sahibləri qarınayaqlı mollyusklardır.

*A. rugosus* Linton, 1928

Sahibləri: gümüşü qağayı (11,1%; 2 ədəd), adi qağayı (28,6%; 1-2 ədəd).

Lokallaşması: bağırsaq.

Qağayıların parazitidir.

Fəsilə GALACTOSOMATIDAE Morosov, 1950

*Galactosomum phalacrocoracis* Yamaguti, 1939

Sahibləri: iri qarabattaq (85,7%;4-21 ədəd), kiçik qarabattaq (80,0%; 2-19 ədəd).

Lokallaşması: bağırsaq.

Qarabattaqların parazitidir; birinci aralıq sahibləri şirin su və dəniz mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

*Cercarioides aharoni* Witenberg, 1929

Sahibləri: gümüşü qağayı (22,2%; 2-4 ədəd), adi qağayı (28,6%; 1-6 ədəd), kiçik sterna (30,0%; 1-7 ədəd).

Lokallaşması: bağırsaq.

Qağayıkimilərin parazitidir.

*Maritrema echinocirrata* Leonov, 1958

Sahibi: kiçik sterna (10,0%; 2 ədəd).

Lokallaşması: bağırsaq.

Qağayıkimilərin parazitidir; ikinci aralıq sahibləri xul balıqlarıdır.

Fəsilə OPISTHORCHIDAE Braun, 1901

*Opisthorchis geminus* (Looss, 1896)

Sahibləri: iri ağ vağ (37,5%; 2-5 ədəd), kiçik ağ vağ (57,1%; 1-6 ədəd).

Lokallaşması: qaraciyərin öd yolları.

Yırtıcı və caydaqlı quşların parazitidir.

*O. simulans* (Looss, 1896)

Sahibləri: iri ağ vağ (25,0%; 1-6 ədəd), kiçik ağ vağ (28,6%; 1-4 ədəd).

Lokallaşması: qaraciyər.

Ördəklərin parazitidir, yırtıcı quşlarda da qeyd olunur.

*Hepatiarıus longissimus* (Linstow, 1833)

Sahibləri: Misir vağı (16,7%; 1 ədəd).

Lokallaşması: qaraciyərin öd yolları.

Caydaqlılqrın və qazkimilərin parazitidir; ikinci aralıq sahibləri mollyusklar və balıqlardır.

Fəsilə PACHYTREMATIDAE Baer, 1943

*Pachytrema calculus* (Looss, 1907)

Sahibi: kiçik sterna (20,0%; 1-2 ədəd).

Lokallaşması: qaraciyər.

Qağayıkimilərin, cüllütlərin və qazkimilərin parazitidir.

Dəstə SCHISTOSOMATIDA (Skrjabin et Schulz, 1937)

Fəsilə ORNITHOBILHARZIIDAE Azimov, 1970

*Bilharziella polonica* (Kowalewski, 1895)

Sahibləri: kiçik maygülü (22,2%; 1-6 ədəd), Misir vağı (16,7%; 1 ədəd), adi qağayı (28,6%; 3-4 ədəd), kiçik sterna (40,0%; 1-6 ədəd).

Lokallaşması: bağırsağın, qaraciyərin, ürəyin, mədəaltı vəzinin, dalağın və böyrəklərin qan damarları.

Müxtəlif su-bataqlıq quşlarının parazitidir; birinci aralıq sahibləri şirin su mollyusklarıdır, serkariləri aktiv olaraq quşların bədəninə daxil olur. Serkariləri insanın dərisinə girərək, dermatitə səbəb ola bilir.

Dəstə STRIGEIDIDA (La Rue, 1926)

Fəsilə STRIGEIDAE Railliet, 1919

*Strigea falconis* Szidat, 1928

Sahibləri: iri maygülü (75,0%; 4-16 ədəd), kiçik maygülü (77,8%; 2-9 ədəd), iri qarabattaq (28,6%; 1-12 ədəd), kiçik qarabattaq (20,0%; 1-4 ədəd), iri ağ vağ (25,0%; 2 ədəd), kiçik ağ vağ (28,6%; 2-6 ədəd), gümüşü qağayı (88,8%; 2-9 ədəd), adi qağayı (85,7%; 1-11 ədəd).

Lokallaşması: dərialtı piy toxuması və birləşdirici toxuma, qida borusu və traxeyanın ətrafları, boyun, döş, ayaq və baş əzələlərinin fassiyalarının altı.

Əsas sahibləri yırtıcı quşlardır; mezoserkariləri amfibilərin, metaserkariləri isə balıqlardan başqa bütün su heyvanlarının, o cümlədən su-bataqlıq quşlarının müxtəlif toxumalarında lokallaşır.

*Apharyngostrıgea cornu* (Zeder, 1800)

Sahibləri: Misir vağı (33,3%; 1-3 ədəd), iri ağ vağ (37,5%; 2-15 ədəd), kiçik ağ vağ (57,1%; 3-9 ədəd).

Lokallaşması: bağırsaq.

Vağkimilərin parazitidir; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

Fəsilə DIPLOSTOMATIDAE Poirier, 1886

*Dıplostomum chromatophorum* (Brown, 1931)

Sahibləri: gümüşü qağayı (66,6%; 7-18 ədəd), adi qağayı (85,7%; 6-21 ədəd).

Lokallaşması: bağırsaq.

Qağayıkimilərin parazitidir; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

*D. commutatum* (Diesing, 1850)

Sahibləri: adi qağayı (14,3%; 1 ədəd).

Lokallaşması: bağırsaq.

Qağayıkimilərin parazitidir; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

Qağayıkimilərin parazitidir; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

*D. spathaceum* (Rudolphi, 1819)

Sahibləri: gümüşü qağayı (77,7%; 1-8 ədəd), adi qağayı (57,1%; 2-7ədəd).

Lokallaşması: bağırsaq.

Qağayıkimilərin parazitidir; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

*D. volvens* Nordmann, 1832

Sahibi: adi qağayı (28,6%; 1-4 ədəd).

Lokallaşması: bağırsaq.

Qağayıkimilərin parazitidir; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

*Hysteromorpha triloba* (Rudolphi, 1819)

Sahibləri: maygülü (87,5%; 4-15 ədəd), kiçik maygülü (88,9%; 3-18 ədəd), iri qarabattaq (85,7%; 6-19 ədəd), kiçik qarabattaq (80,0%; 5-14 ədəd).

Lokallaşması: bağırsaq.

Qarabattaqların və maygülülərin parazitidir; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

*Posthodıplostomum brevicaudatum* (Nordmann, 1832)

Sahibləri: iri ağ vağ (50,0%; 4-8 ədəd), kiçik ağ vağ (28,7%; 2-8 ədəd).

Lokallaşması: bağırsaq.

Vağkimilərin parazitidir; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

*P. cuticola* (Nordmann, 1932)

Sahibləri: Misir vağı (50,0%; 2-10 ədəd), iri ağ vağ (62,5%; 7-11 ədəd), kiçik ağ vağ (85,7%; 3-9 ədəd).

Lokallaşması: bağırsaq.

Vağkimilərin parazitidir; birinci aralıq sahibləri şirin su mollyuskları, ikinci aralıq sahibləri müxtəlif balıqlardır.

*Tylodelphys clavata* (Nordmann, 1832)

Sahibləri: iri ağ vağ (50,0%; 3-14 ədəd), kiçik ağ vağ (57,1%; 2-8 ədəd).

Lokallaşması: bağırsaq.

Caydaqlılqrın parazitidir; ikinci aralıq sahibləri balıqlardır.

**Təsnifat icmalından görünür ki, bizim qeydə aldığımız trematod növləri tədqiq olunmuş quş növləri üzrə qeyri-bərabər paylanmışlar.** Belə ki, *Strigea falconis* növü 8 quş növündə, *Mesorchis pseudoechinatus* və *Clinostomum complanatum* növlərinin hərəsi 5 quş növündə, *Patagifer bilobus, Echinochasmus coaxatus, Bilharziella polonica* və *Hysteromorpha triloba* növlərinin hərəsi 4 quş növündə, *Echinostoma revolutum, E. coronatus, Cercarioides aharoni, Tanaisia fedtschenkoi, Apharyngostrigea cornu, Diplostomum rutili, D. spathaceum* və *Posthodiplostomum cuticola* növlərinin hərəsi 3 quş növündə, *Echinoparyphium recurvatum, Petasiger exaeretus, P. megacantha, P. phalacrocoracis, Echinochasmus beleocephalus, E. dietzevi, Mesorchis denticulatus, Aporchis massiliensis, A. rugosus, Galactosomum phalacrocoracis, Opisthorchis geminus, O. simulans, Euclinostomum heterostomum, Eucotyle cohni, Plagiorchis brauni, Diplostomum chromatophorum, D. helveticum, D. huronense, Posthodiplostomum brevicaudatum* və *Tylodelphys clavata* hərəsi 2 quş növündə, *Echinostoma sudanense, Paryphostomum testitrifolium, Patagifer skrjabini, Echinochasmus bursicola, E. intermedius, Maritrema echinocirrata, Hepatiarius longissimus, Pachytrema calculus, Clinostomum foliiforme, Diplostomum commutatum* və *D. volvens* növlərinin isə hərəsi yalnız 1 növ quşda tapılmışdır.

Trematodların ən çox parazitlik etdiyi orqan bağırsaq olmuşdur, belə ki, 35 növ trematod yalnız həmin orqanın boşluğunda tapılmışdır. Bu, onunla əlaqədardır ki, bizim qeyd etdiyimiz trematod növlərinin böyük əksəriyyəti öz inkişafını quşların bağırsağında başa çatdıraraq, onun içərisində yetkin fərdə çevrilir. Quşların qaraciyərində və öd yollarında, hava kisələrində 4, böyrəklərində 3, qalan orqanlarının hər birində isə 1–2 trematod növü tapılmışdır. Tədqiq olunmuş quşlardan adi qağayıda 14, iri ağ vağda 13, kiçik ağ vağda 12, gümüşü qağayıda 11, kiçik sternada 10, iri qarabattaqda 9, kiçik qarabattaqda 9, kiçik maygülüdə 8, Misir vağında 7, böyük maygülüdə 6, boz vağda isə 1 növ trematod qeydə alınmışdır.

Balıqyeyən quşların qidasının tərkibi onların trematod faunasında əks olunmuşdur. Belə ki, onlarda qeydə alınmış növlərin əksəriyyəti quşların orqanizminə trematod metaserkariləri ilə yoluxmuş balıqları yeyərkən düşür. Onlardan fərqli olaraq, *Bilharziella polonica* və *Strigea falconis* növləri su quşlarının orqanizminə serkari mərhələsində aktiv olaraq daxil olur. Bunların birincisi

quşun qan damarlarına daxil olub qan dövranında parazitlik edir, ikincisi isə quşun müxtəlif toxumalarında sistalaşıb metaserkarilərə çevrilir, həmin quşu yırtıcı quş yedikdə onun bağırsağında yetkin mərhələyə qədər inkişaf edir.

Bizim apardığımız tədqiqat nəticəsində aşkara çıxarılmış trematodların 12 növü epizootoloji və ya epidemioloji əhəmiyyətə malikdir. Bunlardan *Strigea falconis* metaserkari mərhələsində su quşlarının müxtəlif toxumalarında parazitlik edir, bu quşları yeyən yırtıcı quşların bağırsağında isə cinsi yetkinliyə çatır. Bu parazitlə yoluxmuş ev quşlarının ətinin keyfiyyəti xeyli aşağı olur (Dorokhov, Davydova, 2021, s. 25–31).

*Echinostoma revolutum* növü sormacları və tikanları ilə quşların bağırsaq divarlarının selikli qişasını zədələyir və qanaxmalara səbəb ola bilir. Onun törətdiyi exinostomoz xəstəliyi ev quşlarında da müşahidə olunur (Belizario, Geronilla et al., 2007, s. 1130–1131). *Echinostoma* cinsinin nümayəndələri insanın mədə–bağırsaq sistemində selikli qişanın iltihabına və xoraların əmələ gəlməsinə, ağrılara, ishala, zəiflik və bədən çəkisinin azalmasına səbəb olur. Uzaq Şərq mətbəxinin bütün dünyada yayılması ilə əlaqədar balığın və başqa su heyvanlarının çiy yeyilməsi də çox artmışdır. Bu, həmin trematodların insanların orqanizminə düşmək ehtimallarını artırır (Woon-Mok Sohn, Jong-Yil Chai et al., 2011, s. 117–119; Chai, Fried, Toledo, 2009, s. 147–183).

*Tanaisia fedtschenkoi* növünə yoluxduqda quşların böyrək toxuması yumşalır, sidik kanalları çox genişlənir və dənəvər kütlə ilə dolur. Bu helmint quşların bədən boşluğunda parazitlik etdikdə iltihaba səbəb olur (Sinniah, 1980, s. 423–429).

Serkariləri su heyvanlarının bədəninə aktiv daxil olan *Bilharziella polonica* və *Strigea falconis* növləri insan üçün də təhlükəlidir. Bunların serkariləri suda insana da hücum edərək, onun dərisində kiçik xoralar əmələ gətirir və qeyri-spesifik serkarioza səbəb olur (Akramova, Shakarboyev, Azimov, 2007, s. 21–22; Horak, 2011, s. 779–790; Horak, Mikes et al., 2015, s. 165–190).

*Diplostomum commutatum*, *D. chromatophorum*, *D. rutili*, *D. spathaceum* növlərinin metaserkariləri balıqların gözlərinin büllurunda parazitlik edərək, onları kor edir. Belə balıqlar ya xəstəlikdən ölür, ya da suyun üzünə çıxıb balıqyeyən quşlar tərəfindən yeyilir (Ndeda, Aketch, Onyango, 2013, s. 1–7; Horak, Kolarova, Mikes, 2014, s. 331–364; Sitko, Rząd, 2014, s. 215–224).

*Posthodiplostomum cuticola* növünün metaserkariləri balıqların dərisində qara kapsullar yaradır, balıq körpələrinin bədəni deformasiyaya uğrayır, onurğa sütunu əyilir və elastikliyini itirir. Xəstə balıqlar quşlar tərəfindən asanlıqla ovlanır (Ondrackova, Davidova, Gelnar, 2008, s. 526–529; Ondrackova, Jurajda, 2010, s. 312–325).

Beləliklə, bizim həyata keçirdiyimiz tədqiqatlar nəticəsində balıqyeyən quşlarda qeydə alınmış trematodlardan 3 növü ev quşlarında, 6 növ isə balıqlarda xəstəlik əmələ gətirir, 2 növ insanda da parazitlik edə bilir, 2 növ trematod serkari mərhələsində suda insana hücum edib onun dərisində xoralar əmələ gətirir.

## Nəticə

2017–2020-ci illərdə Azərbaycanın Qərb bölgəsində 21 növə aid olan 94 ədəd balıqyeyən quş tam helmintoloji yarma üsulu ilə tədqiq olunmuş, 3 dəstəyə, 12 fəsiləyə, 26 cinsə aid olan 46 növ trematod aşkara çıxarılmışdır. Bunlardan 1 növ 8 növ quşda, 2 növün hərəsi 5 növ quşda, 4 növün hərəsi 4 növ quşda, 8 növün hərəsi 3 növ quşda, 20 növün hərəsi 2 növ quşda və 11 növün hərəsi yalnız 1 növ quşda qeydə alınmışdır. Quşların qaraciyərində, öd yollarında və hava kisələrində 4, böyrəklərində 3, qalan orqanlarının hər birində isə 1–2 trematod növü tapılmışdır. Adi qağayıda 14, iri ağ vağda 13, kiçik ağ vağda 12, gümüşü qağayıda 11, kiçik sternada 10, iri qarabattaqda 9, kiçik qarabattaqda 9, kiçik maygülüdə 8, Misir vağında 7, böyük maygülüdə 6, boz vağda isə 1 növ trematod qeyd olunmuşdur. Əldə olunmuş trematodlardan 1 növ insanın bağırsağında parazitlik edə bilir, 2 növün serkariləri suda insana hücum edib qeyri-spesifik serkarioza səbəb olur, 2 növ quşlarda, 4 növ isə balıqlarda xəstəlik törədir.

## Ədəbiyyat

1. Akramova, F. D., Shakarboyev, E. B., & Azimov, D. A. (2007). Sovremennoye sostoyzniye epizootologii i epidemiologii bilgartsiozov jivotnykh i cheloveka. *Vestnik vracha*, (2), 21–22.
2. Belizario, V. Y., Geronilla, G. G., Anastacio, M. B., de Leon, W. U., Subaan, A. U., Sebastian, A. C., & Bangs, M. J. (2007). Echinostoma infection in the Philippines. *Emerging Infectious Diseases*, 13, 1130–1131.
3. Bykhovskaya-Pavlovskaya, I. Y. (1962). *Trematody ptits fauny SSSR (ekologigeograficheskiy obzor)*. Moscow–Leningrad: Izd. AN SSSR.
4. Chai, J. Y., Fried, B., & Toledo, R. (2009). Echinostomes in humans. In *The Biology of Echinostomes*. New York: Springer, 147–183.
5. Dorokhov, V. V., & Davydova, O. Ye. (2021). Gel'mintofauna khishchnykh ptits (Strigiformes: Strigidae, Tytonidae) na territorii Nechernozemnoy zony RF. *Fauna, Morphology and Systematics of Parasites*, 15(1), 25–31. https://doi.org/10.31016/1998-8435-2021-15-1-25-31
6. Dorovskikh, G. N., & Stepanov, V. G. (2009). *Metody sbora i obrabotki parazitologicheskikh materialov* (Uchebnoye posobiye). Syktyvkar: Izd-vo Syktyvkarskogo un-ta.
7. Dubinina, M. N. (1971). *Parazitologicheskoye issledovaniye ptits*. Leningrad.
8. Gayevskaya, A. V., Gusev, A. V., Delyamure, S. L., Donets, Z. S., Iskova, V. V., et al. (1975). *Opredelitel parazitov pozvonochnykh Chernogo i Azovskogo morey*. Kiyev: Naukova Dumka.
9. Horak, P. (2011). Snails, waterfowl and cercarial dermatitis. *Freshwater Biology*, 56, 779–790.
10. Horak, P., Kolarova, L., & Mikes, L. (2014). Schistosomatoidea and Diplostomoidea. In *Digenetic Trematodes. Advances in Experimental Medicine and Biology* (Vol. 766), 331–364.
11. Horak, P., Mikes, L., Lichtenbergova, L., Skala, V., Soldanova, M., & Brant, S. V. (2015). Avian schistosomes and outbreaks of cercarial dermatitis. *Clinical Microbiology Reviews*, 28, 165–190.
12. Mustafayev, Q. T., & Sadıqova, N. A. (2005). *Azərbaycanın quşları*. Çaşıoğlu.
13. Ndeda, V. M., Aketch, B. O., & Onyango, D. M. (2013). Effect of Diplostomum species on length-weight relationship of farmed Nile tilapia in Kibos Area, Kisumu City, Kenya. *Fisheries and Aquaculture Journal*, 60, 1–7.
14. Ondrackova, M., & Jurajda, P. (2010). Susceptibility of fish infected by metacercariae of *Posthodiplostomum cuticola* (Nordmann, 1832) to fish predation. *Ecological Research*, 25(3), 312–325.
15. Ondrackova, M., Davidova, M., & Gelnar, M. (2008). Susceptibility of Prussian carp infected by metacercariae of *Posthodiplostomum cuticola* (Nordmann, 1832) to fish predation. *Ecological Research*, 23(4), 526–529.
16. Sinniah, B. (1980). *Tanaisia fedtschenkoi* from body cavity of *Gallus gallus*. *Southeast Asian Journal of Tropical Medicine and Public Health*, 11(3), 423–429.
17. Sitko, J., & Rząd, I. (2014). *Diplostomum* and *Ornithodiplostomum scardinii* (Diplostomidae, Digenea) species from naturally infected birds (Anatinae) in the Czech Republic and Poland: Morphological, morphometric and ecological features. *Helminthologia*, 51(3), 215–224.
18. Tuayev, D. Q. (1996). *Azərbaycan quşlarının kataloqu*. Şur.
19. Vahidova, S. M. (1978). *Gelminty ptits Azerbaydzhana*. Elm.
20. Woon-Mok Sohn, Chai, J. Y., Yong, T.-S., Eom, K. S., Yoon, C.-H., Sinuon, M., Socheat, D., & Lee, S.-H. (2011). *Echinostoma revolutum* infection in children, Pursat Province, Cambodia. *Emerging Infectious Diseases*, 17(1), 117–119.

Daxil oldu: 22.02.2025
Qəbul edildi: 14.06.2025

DOI: https://doi.org/10.36719/2663-4619/119/65-68

**Vuqar Garagurbanli**
Scientific Research Institute of Fruit and Tea Cultivation
PhD student
https://orcid.org/0009-0005-1935-8170
vqarqar@gmail.com

# Evaluation of the Resistance of Almond Varieties to Major Pathogens Under Artificial Inoculation

## Abstract

Almond production is increasingly threatened by fungal and bacterial diseases, exacerbated by intensive farming and climate variability. This study assesses the resistance of twelve almond (*Prunus dulcis*) cultivars to four significant pathogens: *Monilinia laxa* (brown rot), *Colletotrichum acutatum* (anthracnose), *Xanthomonas arboricola* pv. *pruni* (bacterial spot), and *Pseudomonas syringae* pv. *syringae* (bacterial canker). Using standardized artificial inoculation techniques in greenhouse and growth chamber environments, disease severity was quantitatively scored. Notable cultivar-level resistance differences were observed, with 'Guara' and 'Lauranne' exhibiting strong tolerance across multiple pathogens. These findings offer a foundation for breeding disease-resistant almonds and reducing reliance on chemical controls.

***Keywords:*** *almond, cultivar resistance, pathogen screening, artificial inoculation, brown rot, bacterial spot, anthracnose, integrated disease management*

**Vüqar Qaraqurbanlı**
Meyvəçilik və Çayçılıq Elmi Tədqiqat İnstitutu
doktorant
https://orcid.org/0009-0005-1935-8170
vqarqar@gmail.com

# Badam növlərinin əsas patogenlərə qarşı müqavimətinin qiymətləndirilməsi süni peyvənd altında

## Xülasə

Badam istehsalı intensiv əkinçilik və iqlim dəyişkənliyi ilə daha da şiddətlənən göbələk və bakterial xəstəliklərlə getdikcə daha çox təhlükə altındadır. Bu tədqiqat on iki badam (Prunus dulcis) sortlarının dörd əhəmiyyətli patogenə qarşı müqavimətini qiymətləndirir: Monilinia laxa (qəhvəyi çürük), Colletotrichum acutatum (antraknoz), Xanthomonas arboricola pv. pruni (bakterial ləkə) və Pseudomonas syringae pv. syringae (bakterial xərçəng). İstixana və böyümə kamerası mühitlərində standartlaşdırılmış süni peyvənd üsullarından istifadə edərək xəstəliyin şiddəti kəmiyyətcə qiymətləndirilib. Sort səviyyəsində nəzərəçarpacaq müqavimət fərqləri müşahidə edildi, "Quara" və "Lauranne" çoxlu patogenlər arasında güclü tolerantlıq nümayiş etdirdi. Bu tapıntılar xəstəliyə davamlı badam yetişdirmək və kimyəvi nəzarətdən asılılığı azaltmaq üçün əsas təklif edir.

***Açar sözlər:*** *badam, sort müqaviməti, patogen skrininq, süni peyvənd, qəhvəyi çürük, bakterial ləkə, antraknoz, inteqrasiya edilmiş xəstəliklərin idarə edilməsi*

## Introduction

Almond orchards globally face recurring challenges from pathogens that threaten yield, tree longevity and fruit quality. Key diseases include brown rot, anthracnose, bacterial spot and bacterial canker, which impact flowers, fruit, leaves and woody tissues. Traditional control relies on fungicides and bactericides, raising sustainability and resistance concerns. Incorporating disease

resistance through breeding and selection offers a long-term, eco-friendly strategy (Teviotdale et al., 2001; Gradziel et al., 2013; Fernández i Martí et al., 2021).

**Research**

This study focuses on evaluating the relative resistance of twelve widely grown or regionally important almond cultivars using artificial inoculation. This method ensures controlled pathogen exposure and reproducible results, critical for early-stage screening (De Cal et al., 2009; Duval et al., 2005).

## 2. Materials and Methods

### 2.1 Plant Material

Twelve cultivars were chosen to represent genetic and geographic diversity: 'Nonpareil', 'Carmel', 'Tuono', 'Ferragnès', 'Supernova', 'Guara', 'Texas', 'Sahand', 'Shokofeh', 'Mission', 'Marcona', and 'Lauranne'. All were propagated on uniform rootstocks and maintained under greenhouse conditions.

### 2.2 Pathogen Selection and Inoculum Preparation

Pathogens were selected based on their prevalence in almond-producing regions:

- *Monilinia laxa* (brown rot)
- *Colletotrichum acutatum* (anthracnose)
- *Xanthomonas arboricola* pv. *pruni* (bacterial spot)
- *Pseudomonas syringae* pv. *syringae* (bacterial canker)

Pathogen isolates were sourced from symptomatic plant material and cultured on PDA or NA media. Spore and cell suspensions were standardized to $10^5$ (fungi) and $10^6$ CFU/mL (bacteria).

### 2.3 Inoculation Protocols

Detached shoot and leaf assays were complemented by whole-plant inoculations. Wounding was applied where necessary to facilitate infection. Samples were incubated at 22–25°C with >90% humidity for 7–14 days (Phillips & Burkholder, 1983; Duval et al., 2005).

### 2.4 Disease Assessment and Scoring

Severity was rated on a 0–5 scale:

- 0: No symptoms
- 1: Trace lesions
- 2: Mild (1–25%)
- 3: Moderate (26–50%)
- 4: Severe (51–75%)
- 5: Very severe (>75% or tissue death)

Cultivars were categorized as:

- Resistant (R): <1.5
- Moderately Resistant (MR): 1.5–2.5
- Susceptible (S): >2.5

## 3. Results

### 3.1 Resistance to Fungal Pathogens

- *Monilinia laxa*: 'Guara', 'Lauranne', and 'Sahand' had minimal lesion development, indicating strong resistance. 'Nonpareil' and 'Carmel' were highly susceptible.
- *Colletotrichum acutatum*: 'Ferragnès' and 'Tuono' showed moderate resistance. 'Texas' and 'Mission' exhibited widespread necrosis.

### 3.2 Resistance to Bacterial Pathogens

- *X. arboricola* pv. *pruni*: 'Supernova' and 'Marcona' showed limited spotting. 'Shokofeh' and 'Nonpareil' were severely affected.
- *P. syringae* pv. *syringae*: 'Lauranne' and 'Guara' showed high tolerance. 'Texas' and 'Mission' were notably susceptible.

### 3.3 Overall Cultivar Ratings

| Cultivar | Brown Rot | Anthracnose | Bacterial Spot | Bacterial Canker | Resistance Level |
|---|---|---|---|---|---|
| Guara | R | MR | R | R | High |
| Lauranne | R | MR | MR | R | High |
| Ferragnès | MR | R | MR | MR | Moderate–High |
| Tuono | MR | R | S | MR | Moderate |
| Supernova | MR | MR | R | MR | Moderate–High |
| Sahand | R | S | MR | MR | Moderate |
| Marcona | S | MR | R | S | Moderate |
| Shokofeh | MR | S | S | MR | Low–Moderate |
| Texas | S | S | MR | S | Low |
| Mission | S | S | MR | S | Low |
| Nonpareil | S | S | S | S | Very Low |
| Carmel | S | MR | S | MR | Low |

## 4. Discussion

The data show considerable variation in cultivar resistance. 'Guara' and 'Lauranne' were consistently more tolerant across pathogen types, aligning with previous findings (López-Moral et al., 2019; Fernández i Martí et al., 2021). Their use in breeding programs could reduce disease pressure and chemical input.

Susceptibility of commercial standards like 'Nonpareil' suggests an urgent need for integrating resistance traits in high-value cultivars. Artificial inoculation provided effective early screening, although field validation remains essential (De Cal et al., 2009; Palou et al., 2002).

## Conclusion

Artificial inoculation is a practical tool for screening almond disease resistance. 'Guara' and 'Lauranne' emerge as promising candidates for resistant orchard systems. Results support the inclusion of disease resistance as a key breeding objective in response to climate-induced disease dynamics.

## References

1. Adaskaveg, J. E., et al. (2008). Management of almond brown rot with new fungicides. *Plant Disease, 92*(4), 509–516. https://doi.org/10.1094/PDIS-92-4-0509
2. Baró-Montel, N., et al. (2023). Identification and management of *Monilinia* species in Mediterranean almond orchards. *Plant Pathology, 72*(2), 354–365. https://doi.org/10.1111/ppa.13679
3. Belisario, A., et al. (2021). Emerging fungal and bacterial pathogens in almond orchards: Implications for climate adaptation. *European Journal of Plant Pathology, 159*(2), 319–334. https://doi.org/10.1007/s10658-020-02130-9
4. Chen, Y., et al. (2022). Application of CRISPR in resistance breeding of woody fruit trees. *Horticulture Research, 9*, uhac079. https://doi.org/10.1093/hr/uhac079
5. Damm, U., et al. (2012). *Colletotrichum* species on almond in Europe. *Studies in Mycology, 73*, 1–36. https://doi.org/10.3114/sim0014
6. De Cal, A., et al. (2009). Brown rot control in almond orchards. *Crop Protection, 28*(6), 518–525. https://doi.org/10.1016/j.cropro.2009.01.009
7. Duval, H., et al. (2005). Characterization of almond responses to *Colletotrichum*. *Journal of Plant Pathology, 87*(1), 41–48.
8. EFSA Panel on Plant Health. (2020). Pest categorisation of *Xanthomonas arboricola* pv. *pruni*. *EFSA Journal, 18*(1), 5927. https://doi.org/10.2903/j.efsa.2020.5927

9. Fernández i Martí, A., et al. (2021). Advances in marker-assisted almond breeding. *Frontiers in Plant Science*, *12*, 653510. https://doi.org/10.3389/fpls.2021.653510
10. Gradziel, T. M., et al. (2013). Breeding for disease resistance in almond. *HortScience, 48*(3), 289–293. https://doi.org/10.21273/HORTSCI.48.3.289
11. Lang, G. A. (2000). *Pseudomonas syringae* infections in almond nurseries. *Journal of Horticultural Science & Biotechnology, 75*(4), 453–460. https://doi.org/10.1080/14620316.2000.11511269
12. López-Moral, A., et al. (2019). Evaluation of almond cultivars for resistance to brown rot. *Plant Pathology, 68*(1), 148–157. https://doi.org/10.1111/ppa.12924
13. Massampuor, A., et al. (2020). Genetic variability in almond cultivars for resistance to bacterial spot. *Scientia Horticulturae, 272*, 109538. https://doi.org/10.1016/j.scienta.2020.109538
14. Michailides, T. J., et al. (1996). Epidemiology and control of anthracnose on almonds. *Plant Disease*.
15. Palou, L., et al. (2002). Postharvest treatment against brown rot in almonds. *Postharvest Biology and Technology, 25*(1), 61–72. https://doi.org/10.1016/S0925-5214(01)00158-0
16. Phillips, D. J., & Burkholder, W. (1983). Bacterial spot of stone fruits. *Annual Review of Phytopathology, 21*, 193–211. https://doi.org/10.1146/annurev.py.21.090183.001205
17. Teviotdale, B. L., et al. (2001). *Compendium of almond diseases and pests*. APS Press.
18. Wormald, H. (1927). A study of bacterial canker of stone fruits. *Phytopathology, 17,* 61–68.

Received: 20.04.2025
Accepted: 01.07.2025

DOI: https://doi.org/10.36719/2663-4619/119/69-73

**Elnarə Muradova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
https://orcid.org/0009-0002-9955-0266
elnaramuradova@rambler.ru

# Aqrosenozda alma meyvəyeyəninin (Laspeyresia pomonella L.) populyasiyasının müasir vəziyyəti

## Xülasə

Məqalədə 2023–2024-cü illərdə Quba ərazisində yerləşən fermer təsərrüfatlarında tədqiq edilmiş alma meyvəyeyəninin yayılması, bioekoloji xüsusiyyətləri və populyasiyanın ekoloji göstəriciləri haqqında məlumat verilir. Zərərvericilərin müxtəlif nəsillərinin inkişafı dövründə marşrut üsullarla təsərrüfatlarda ağaclara baxılmış, yoluxma dərəcəsi müəyyənləşdirilmişdir. Meyvəyeyənin bioloji xüsusiyyətləri açıq sahə ilə yanaşı, xüsusi entomoloji bağçalarda (həmin mühitdə süni bağçalarda) bəslənilən fərdlər üzərində də dəqiqləşdirilmişdir.

Ağac gövdələrinə bağlanmış qurşaqlar (kəmərlər) vasitəsilə puplaşmanın başlanğıcı və sonu, puplaşma dinamikası və kütləvi puplaşma dövrü müəyyən edilmişdir.

Ayrı-ayrı nəsillərin inkişafında üst-üstə düşən tırtıl fazalarının başlama və sona çatma müddətləri tırtılların inkişaf dinamikası əsasında müəyyənləşdirilmişdir. Kəpənəklərin məhsuldarlığı, ayrı-ayrı inkişaf mərhələlərinin davametmə müddətləri entomologiyada qəbul olunmuş metodlar əsasında həyata keçirilmişdir.

***Açar sözlər:*** *kənd təsərrüfatı, zərərvericilər, alma meyvəyeyəni, pestisid, region*

**Elnara Muradova**
Azerbaijan State Pedagogical University
https://orcid.org/0009-0002-9955-0266
elnaramuradova@rambler.ru

# Current Status of the Apple Fruit Eater (*Laspeyresia Pomonella l.*) Population in the Agrocenosis

## Abstract

This article presents research conducted in 2023–2024 on the distribution, bioecological characteristics and ecological indicators of the population of the Codling Moth (Cydia pomonella) in apple orchards located in the Guba region. During the development periods of different generations of the pest, orchard trees were examined using route-based observation methods and the infestation rate was determined. The biological characteristics of the codling moth were studied not only under open field conditions, but also clarified through observations of individuals reared in special entomological gardens (artificial orchard environments created for research purposes).

The beginning and end of pupation, pupation dynamics and the period of mass pupation were determined using belts (bands) attached to tree trunks. The overlapping periods of larval stages in the development of different generations were identified based on the dynamics of larval development. The fecundity of the butterflies and the duration of individual developmental stages were assessed using standard entomological methods.

***Keywords:*** *agriculture, pests, apple fruit eater, pesticide, region*

## Giriş

Respublikamızda kənd təsərrüfatının digər sahələrinin inkişaf etdirilməsi ilə yanaşı, meyvə istehsalını artırmaq üçün mövcud imkanlardan tam istifadə edilməsi vacib şərtlərdən biridir. Onu da

qeyd etmək lazımdır ki, yüksək aqrotexniki üsulların həyata keçirilməsi ilə yanaşı, alma zərərvericilərinə qarşı kompleks mübarizə tədbirlərini tətbiq etmədən yüksək və keyfiyyətli məhsul əldə etmək mümkün deyildir.

Şəxsi təsərrüfat sahiblərinin meyvə ağaclarının zərərvericilərinə qarşı kimyəvi mübarizə üsullarına müraciət etməsi, bu məqsədlə müxtəlif pestisidlərdən həddən artıq istifadə olunması ətraf mühit və sağlamlıq üçün bir sıra problemlər yaradır. Bu problemlərin aradan qaldırılması həm keyfiyyətli, həm də ekoloji təmiz məhsulun bazara çıxarılması baxımından çox əhəmiyyətlidir. Belə yanaşma bağçılıqda daha az pestisid istifadə edilməsinə, meyvəçiliyin daha yüksək iqtisadi gəlirə malik olan istehsal sahəsinə çevrilməsinə səbəb ola bilər (Nuriyeva, Əhmədov, Kərimova, Hüseynova & Məhərrəmova, 2008).

**Tədqiqat**

Meyvəçiliyin intensiv yolla inkişaf etdiyi bir dövrdə bitkiləri xəstəlik və zərərvericilərdən səmərəli mühafizə yollarını araşdırmaq və tətbiq etmək günün ən aktual problemlərindən biridir. Bu istiqamətdə meyvə ağaclarının zərərli orqanizmlərdən qorunması da vacib məsələlərdəndir. Alma meyvəyeyəni respublikanın əsas bağçılıq zonalarından biri olan Quba rayonunun alma bağlarında geniş yayılmış və hər il məhsuldarlığa müxtəlif dərəcədə ziyan vuran ciddi zərərvericilərdən biridir. Zərərvericilərə qarşı bioloji cəhətdən əsaslandırılmış səmərəli mübarizə tədbirləri hazırlamaq üçün ilk növbədə aqrosenozda onun bioloji və ekoloji xüsusiyyətlərinin öyrənilməsi çox vacibdir (Velikan').

**Material və metodlar**

Alma meyvəyeyəninin yayılması, bioekoloji xüsusiyyətləri və populyasiyanın ekoloji göstəriciləri 2023–2024-cü illərdə Quba ərazisində yerləşən fermer təsərrüfatlarında tədqiq edilmişdir.

Zərərvericilərin müxtəlif nəsillərinin inkişafı dövründə marşrut üsullarla təsərrüfatlarda ağaclara baxılmış, yoluxma dərəcəsi müəyyənləşdirilmişdir. Meyvəyeyənin bioloji xüsusiyyətləri açıq sahə ilə yanaşı, xüsusi entomoloji bağçalarda (həmin mühitdə süni bağçalarda) bəslənilən fərdlər üzərində də dəqiqləşdirilmişdir.

Ağac gövdələrinə bağlanmış qurşaqlar (kəmərlər) vasitəsilə puplaşmanın başlanğıcı və sonu, puplaşma dinamikası və kütləvi puplaşma dövrü müəyyən edilmişdir.

Ayrı-ayrı nəsillərin inkişafında üst-üstə düşən tırtıl fazalarının başlama və sona çatma müddətləri tırtılların inkişaf dinamikası əsasında müəyyənləşdirilmişdir. Kəpənəklərin məhsuldarlığı, ayrı-ayrı inkişaf mərhələlərinin davametmə müddətləri entomologiyada qəbul olunmuş metodlar əsasında həyata keçirilmişdir (Danilevskiy & Kuznetsov, 1968; Fasulati, 1971; Kozhanchikov, 1935).

## Nəticə

Bu zərərvericinin yayılma arealı çox geniş olub, Qərbi və Şərqi Avropanı, Orta Asiyanı, Şərq və Qərbi Sibiri, Uzaq Şərqi, Şimal və Cənubi Afrikanı, Yaxın Şərqi, Cənubi və Şimali Amerikanı, Tasmaniya, Yeni Zelandiya, Qafqaz və s. əhatə edir.

Qeyd etmək lazımdır ki, respublikamızda alma meyvəyeyəninin tədqiqinə dair bir sıra ədəbiyyat məlumatları mövcuddur. Belə ki, Səfərova və Əliyevanın qoz aqrosenozunda apardıqları araşdırmalara görə alma meyvəyeyəni Qəbələ rayonu ərazisində alma, armud, heyva və s. bitkilərlə yanaşı, qoz bitkisinə də xeyli ziyan vurur. Regionda bu zərərverici əsasən tırtıl mərhələsində ağacların qabıqları altında, yarıqlarda, həmçinin qoz meyvəsinin içərisində qışlayır. Yazda havanın temperaturu 10–12°C-dən yuxarı olduqda (martın sonu–aprelin əvvəli) tırtıllar qışlamadan çıxaraq qruplaşmağa başlayır. Pup mərhələsi temperaturdan asılı olaraq 3–4 həftə uzana bilir. May ayının birinci ongünlüyündə puplardan kəpənəklər uçmağa başlayır. Qeyd etmək lazımdır ki, dişi kəpənəklər erkəklərdən bir neçə gün (2–4 gün) əvvəl uçurlar. Pupdan çıxdıqdan sonra kəpənəklər müxtəlif bitkilərin nektarları ilə qidalanaraq mayalanmağa başlayırlar. Mayalandıqdan 2–3 gün sonra dişi fərdlər birinci nəslin başlanğıcı olan yumurtaları qoyurlar. Bir dişi fərd orta hesabla 55–60 yumurta qoyma potensialına malikdir. Yumurtalar əsasən yarpaqlar üzərinə, bəzən isə meyvələrin üzərinə qoyulur. Yumurtalar qoyulduqdan 7–12 gün sonra tırtıllar çıxmağa başlayır. Tırtıllar bir ayadək

inkişaflarını davam etdirirlər (27–31 gün). Öz inkişafları dövründə hər tırtıl 3–4 meyvəni zədələyə bilir. Zədələnmiş meyvələr tırtılla birlikdə bəzən yerə düşür. Tırtıllar tam qidalandıqdan sonra ağacların qabığı altına, yarıqlara və s. yerlərə girərək özləri üçün barama hörür və puplaşırlar. Puplaşmadan 11–12 gün sonra birinci nəslin kəpənəkləri uçmağa başlayırlar. Birinci nəslin inkişafı yumurtadan imaqoya qədər təxminən 45–50 günə başa çatır. İkinci nəslin yumurtaları (I nəsil kəpənəklərinin qoyduğu) iyulun ikinci yarısına təsadüf edir. Yumurtaların inkişafı 5–8 günə başa çatır. İyulun sonunda yumurtadan çıxmış tırtıllar şirəli yarpaqlar və meyvələrlə qidalanırlar. Tırtılların bəziləri öz inkişaflarını 20–22 günə başa vuraraq puplaşırlar. Sonrakı yumurtadan çıxan tırtıllar isə inkişaflarını tam başa çatdırmadan ikinci nəslin fərdləri kimi meyvə ağaclarının qabıqları altında və ya yarıqlarda qışlamağa gedirlər. İnkişaflarını başa vuran tırtıllar isə avqustun ikinci ongünlüyündə puplaşırlar. Avqustun ikinci yarısında pupdan çıxan kəpənəklər öz yumurtalarını bəzi meyvə ağaclarına və əsasən də qoz bitkisinin meyvə və yarpaqları üzərinə qoyurlar. Avqustun üçüncü ongünlüyündə tırtıllar öz inkişaflarını qoz bitkisinin meyvələri daxilində davam etdirərək müəyyən hissəsi elə qidalandığı meyvələrin içərisində, digər bir hissəsi isə ağacların qabıqları altında və ya gövdənin yarıqlarında tırtıl mərhələsində növbəti ilin yazınadək qışlamağa gedirlər. Müəlliflərin nəticələrinə görə alma meyvəyeyəni Qəbələ rayonu ərazisində 2–3 nəsil verə bilir. Qoz bitkilərinə əsasən ikinci və üçüncü nəsil tırtılları ziyan vururlar (Nərimanova & Əhmədov, 2015).

Meyvəçiliyin əsas bazalarından biri olan Quba ərazisində 2021–2023-cü illərdə aqrosenozda geniş yayılmış alma meyvəyeyəninin bəzi bioekoloji xüsusiyyətləri bizim tərəfimizdən ətraflı araşdırılmışdır.

Tədqiqatlar zamanı müəyyən edilmişdir ki, stasionar ərazilərdə alma meyvəyeyəni iki tam nəsil verir, üçüncü nəsil isə həm sonuncu yaş mərhələsində olan tırtıl, həm də pup mərhələsində ipək baramacıqlar içərisində qışlamaya gedir.

Qışlamaya müxtəlif mərhələlərdə getdiyi üçün yazda onların qışlamadan çıxma müddətləri də uzun bir dövrü əhatə edir. Yəni, pup mərhələsində qışlamaya gedən fərdlər aprelin ikinci yarısında pupdan çıxdığı halda, tırtıl mərhələsində qışlamaya gedənlər isə aprel ayında hələ puplaşma mərhələsində olurlar. Onlardan yalnız may ayında kəpənəklər uçmağa başlayır.

Qeyd etmək lazımdır ki, bu zərərvericiyə alma əkilən bütün coğrafi zonalarda rast gəlinir. İqlim şəraitindən asılı olaraq birdən dördədək nəsil verə bilir. Zərərvericinin zədələdiyi meyvələr vaxtından əvvəl, yetişmədən tökülür. Eyni zamanda zərərvericinin zədələdiyi meyvələr digər mikroorqanizmlər üçün qidalanma və çoxalma məskəninə çevrilir. Odur ki, bu zərərvericinin bioekoloji göstəricilərinin müxtəlif ekoloji amillərdən asılılığının tədqiqinin çox böyük elmi və praktiki əhəmiyyəti var. Bu baxımdan nəslin törədicisi olan kəpənəklərin (imaqoların) inkişafı və reproduktivliyinə temperaturun təsirinin tədqiqi xüsusi əhəmiyyət kəsb edir (Velikan', Gegechkori & Golu, 1984).

2022–2023-cü illərdə alma meyvəyeyəni kəpənəyinin inkişaf və reproduktivliyinə temperaturun təsirinə aid geniş tədqiqatlar aparmışıq. Təcrübələrdən məlum olmuşdur ki, alma meyvəyeyəninin laboratoriya şəraitində kütləvi çoxaldılması üçün optimal temperatur rejimi 20–25°C hüdudlarındadır.

Aşağı temperaturda (15°C) kəpənəklər 34–35 gün yaşadıqları halda, bəzi fərdlər hətta 45–50 günədək yaşaya bilirlər. Bu, onu göstərir ki, kəpənəklərin bu xüsusiyyətləri onların qeyri-əlverişli mühitdə öz həyatiliyini qoruyub saxlamağa imkan yaradır, baxmayaraq ki, reproduktivlikləri aşağı düşür (Vasil'yev, Livshits, 1984).

Aparılmış təcrübələr alma meyvəyeyəninin inkişafı üçün lazımi temperatur parametrlərini əldə etməyə imkan verir.

Göründüyü kimi, alma meyvəyeyəni özünəməxsus fenoloji inkişafa malik olub, təsərrüfatlara ciddi ziyan vuran növlərdəndir. Odur ki, 2023–2024-cü illərdə bu zərərvericinin aqrosenozda populyasiyasının vəziyyətini müəyyənləşdirməyi qarşıya məqsəd qoyduq.

Zərərvericilərin populyasiyalarının ekoloji göstəricilərinin tədqiqi ilə respublikamızda bir sıra mütəxəssis-alimlər məşğul olmuşlar (Zlotin, 1989).

Belə ki, bir qrup tədqiqatçılar tərəfindən (Metodicheskiye ukazaniya po registratsionnym ispytaniyam insektitsidov, akaritsidov, mollyuskotsidov i rodentitsidov v sel'skom khozyaystve

[Red. V. I. Dolzhenko], 2004) 2004–2008-ci illərdə Quba-Xaçmaz, Şamaxı-İsmayıllı bölgələrində meşələrə hər il ciddi ziyan vuran tək ipəksarıyanın (Lymantria dispar L.) populyasiyasının vəziyyəti ətraflı araşdırılmış və tək ipəksarıyanın zərərvurma həddinə görə Azərbaycanın Böyük Qafqaz ərazisi orta dərəcədə zədələnmiş ərazilərə aid olduğu qeydə alınmışdır. Belə ki, V. İ. Doljenkonun göstərdiyi kimi, orta dərəcədə zədələnmə ərazilərində 1 ağacda qışlamadan çıxan 0,5–1 yumurta topasına rast gəlinirsə, bu, bir qayda olaraq tək ipəksarıyanın əlverişli şəraitdə iqtisadi zərərvurma həddini keçə biləcəyini göstərir (Səfərova & Əliyeva, 2022).

Nərimanova və Əhmədov tərəfindən 2013–2014-cü illərdə Böyük Qafqaz təbii vilayətinin bəzi rayonlarında Cetonia aurota L., 1758 zərərvericisinin populyasiyasının fizioloji göstəriciləri – məskunlaşma dərəcələri, çoxalma və yayılma əmsalları araşdırılmış və praktiki təkliflər verilmişdir (Vasil'yev, 1951).

Quba rayonu ərazisində apardığımız tədqiqatlar zamanı zərərvericinin sayının hesablanması və populyasiyasının dinamikasını müəyyən etmək üçün A. Z. Zlotin metodundan istifadə edilmişdir (Fasulati, 1971).

Məlumdur ki, biotopun məskunlaşması mütləq, nisbi və orta ola bilər. Mütləq məskunlaşma növün bioloji xüsusiyyətlərindən, məskunlaşmanın ölçü metodu və texnikasından asılıdır. Bu göstərici bir hesablama vahidinə (1 m², 1 ağac, yüz çalma və s.) düşən fərdlərin sayı ilə ölçülür və aşağıdakı düsturla hesablanır:

**Mm = K / H**, burada:

**K** – nümunədəki sağlam (yəni yoluxmamış) ağacların sayıdır,

**H** – nümunədəki hesablama vahidinin ümumi sayıdır.

Mütləq məskunlaşma qida təminatının göstəricisi kimi populyasiyanın vəziyyətinin qiymətləndirilməsi zamanı hesablanır. Əgər populyasiya üzərində müşahidələr bir biotopda bir neçə il ərzində aparılırsa, o zaman mütləq məskunlaşma göstəricilərinin qiymətləri növün çoxalma (sayın artması) əmsalının hesablanmasında istifadə edilir.

Çoxalma əmsalı növün biotopda mütləq məskunlaşmasının bu ilki göstəricisinin keçən ilki göstəricisinə nisbəti və ya növ ildə bir neçə nəsil verirsə, iki ardıcıl nəsildəki analoji nisbəti ifadə edir və aşağıdakı düsturla hesablanır:

- **Mm2023 = K / H = 65 / 100 = 0,65**
- **Mm2024 = K / H = 38 / 100 = 0,38**

Aqrosenozda çoxalma əmsalı ikiillik məlumata görə:

**Çə = Mm2024 / Mm2023 = 0,38 / 0,65 = 0,58**

**Cədvəl. Aqrosenozda zərərverici populyasiyasının ekoloji göstəriciləri.**

| Göstəricilər | Düsturlar | 2023 | 2024 |
|---|---|---|---|
| Mütləq məskunlaşma | Mm=K/H | 0,65 | 0,38 |
| Çoxalma əmsalı | Çə=Mm²/Mm1 | 0,58 | |

2023-cü ildə apardığımız tədqiqatın nəticəsinə görə, seçilmiş biotopda mütləq məskunlaşma 0,65 olmuşdur, 2024-cü ildə isə bu rəqəm təxminən iki dəfəyədək azalaraq 0,38 olmuşdur.

Çoxalma əmsalı isə 0,58 təşkil etmişdir. Bu isə o deməkdir ki, biotopda 2024-cü ildə zərərvericinin mütləq məskunlaşması 2023-cü ilə nisbətən xeyli aşağı olmuşdur. Görünür, belə müsbət nəticənin səbəbi 2024-cü ildə aqrosenozda kimyəvi mübarizə tədbirlərinin zərərverici və entomofaqların fenoloji inkişafına uyğun olaraq və yalnız ciddi ehtiyac olan ərazilərdə aparılması, bu səbəbdən də aqrosenozda entomofaqların sayının artması olmuşdur.

Bu növlər arasında *Bracon hebetor*, *Apanteles solitarius*, *Brachymeria intermedia*, *Trichogramma evanescens*, *Coccinella septempunctata*, *Chrysopa carnea* və bəzi digər növlər zərərvericilərin təbiətdə sayının tənzimlənməsində mühüm əhəmiyyətə malikdir.

Tədqiqat illərində aldığımız nəticələrə əsasən, stasionar təsərrüfatda zərərvericiyə qarşı mübarizə tədbirləri həyata keçirərkən ərazidə entomofaqların fəaliyyətinin nəzərə alınması tövsiyə olunmuşdur.

## Ədəbiyyat

1. Danilevskiy, A. S., & Kuznetsov, V. I. (1968). *Listovertki Tortricidae, triba plodozhorki Laspeyresiini*. M.-L.: AN SSSR (Fauna SSSR, novaya seriya, N 98. Nasekomyye cheshuyekrylyye. T. 5, vyp. 1), 636.
2. Fasulati, K. K. (1971). *Polevoye izucheniye nazemnykh bespozvonochnykh*. Moskva: Vysshaya shkola, 424.
3. Kozhanchikov, I. V. (1935). K voprosu ob izmeneniyakh fiziologicheskikh protsessov pri razvedenii nasekomykh v razlichnykh termicheskikh usloviyakh. *Zashchita rasteniy, 5*, 75–90.
4. Metodicheskiye ukazaniya po registratsionnym ispytaniyam insektitsidov, akaritsidov, mollyuskotsidov i rodentitsidov v sel'skom khozyaystve (Red. V. I. Dolzhenko). (2004). *Sankt-Peterburg: VIZR,* 363 s.
5. Nərimanova, V. S., & Əhmədov, B. Ə. (2015). Cetonia aurata L., 1758 (Coleoptera, Scarabaeidae, Cetonia) populyasiyasının fizioloji göstəriciləri. *Azərbaycan Zooloqlar Cəmiyyətinin Əsərləri, 7*(1), 99–104.
6. Nuriyeva, İ. A., Əhmədov, B. Ə., Kərimova, İ. Q., Hüseynova, E. A., & Məhərrəmova, Ş. M. (2008). Böyük Qafqazın Azərbaycan meşələrində tək pəksarıyanın (Lymantria dispar L.) populyasiyasının müasir vəziyyəti haqqında. *Azərbaycan Zooloqlar Cəmiyyətinin Əsərləri, 1*, 384–387.
7. Səfərova, İ. M., & Əliyeva, M. Q. (2022). Alma meyvəyeyəni qoz (Laspeyresiya pomonella L.) bitkisinin zərərvericisi kimi. *Sumqayıt Dövlət Universiteti*. https://www.ssu-conferenceproceedings.edu.az
8. Vasil'yev, V. P. (1951). Ekologicheskiye usloviya razvitiya i zonal'noye rayonirovaniye rasprostraneniya yablonnoy plodozhorki v USSR. *Sbornik rabot po zashchite rasteniy, Ukrainskiy institut plodovodstva, 32*, 4–50.
9. Vasil'yev, V. P., & Livshits, I. Z. (1984). *Vrediteli plodovykh kul'tur*. Moskva: Kolos, 399.
10. Velikan', V. S., Gegechkori, A. M., & Golu, V. B. (1984). *Opredelitel' vrednykh i poleznykh nasekomykh i kleshchey plodovykh i yagodnykh kul'tur v SSSR* (Sost. L. M. Kopaneva). Leningrad: Kolos, 288.
11. Zlotin, A. Z. (1989). *Tekhnicheskaya entomologiya*. Kiyev: Naukova Dumka, 170.

Daxil oldu: 01.03.2025
Qəbul edildi: 27.05.2025

## RİYAZİYYAT VƏ MEXANİKA ELMLƏRİ

## MATHEMATICS AND MECHANICAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/119/74-82

**Səltənət Veysova**
Milli Müdafiə Universiteti
fizika-riyaziyyat elmləri üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0003-9379-3280
seltenet.veysova63@gmail.com
**Sima Paşayeva**
Milli Müdafiə Universiteti
fizika-riyaziyyat elmləri üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0008-0079-1726
sima.pashayeva73@gmail.com

# Avtonom diferensial tənliklərin həllinin yeganəlik meyarı

### Xülasə

Məqalədə avtonom diferensial tənliklərin həllinin yeganəliyi məsələsinə baxılmışdır. Sıfırları ilə ədəd oxunu funksiyanın işarəsinin sabit olduğu aralıqlara bölən və hər bir aralıqda başlanğıc nöqtəni seçməklə təyin olunmuş funksiyalar üçün Koşi məsələsinin həllinin yeganəliyi və davamlılığı tədqiq olunmuşdur. Bu diferensial tənliyin məxsusi həllinin varlığı araşdırılarkən tənliyin sağ tərəfindəki funksiyanın analitik ifadəsindən və onun sıfırlarının koordinat müstəvisində yerləşməsindən asılı olaraq həllin "birtərəfli" yeganəlik halı müəyyən edilmişdir. Göstərilmişdir ki, verilmiş şərtlər daxilində tənliyin həllinin başlanğıc nöqtənin yaxın ətrafından bu nöqtəyə keçməsi üçün zəruri zaman anı qeyri-məxsusi inteqralla təyin olunur. Sonlu zaman anında həllin yeganəliyinin pozulması qeyri-məxsusi inteqralın bilavasitə yığılan olması ilə, həllin tarazlıq halına keçə bilməməsi isə qeyri-məxsusi inteqralın dağılan olması ilə izah olunduğu və bununla da həllin yeganəliyinin saxlanılması xüsusiyyəti əsaslı öyrənilmişdir.

***Açar sözlər:*** *avtonom diferensial tənlik, həllin varlığı və yeganəliyi, Lipşits şərti, məxsusi həll, "birtərəfli" yeganəlik, istiqamətlər meydanı, inteqral əyrisi, faza portreti*

**Saltanat Veysova**
National Defense University
PhD in Physics and Mathematics
https://orcid.org/0009-0003-9379-3280
seltenet.veysova63@gmail.com
**Sima Pashayeva**
National Defense University
PhD in Physics and Mathematics
https://orcid.org/0009-0008-0079-1726
sima.pashayeva73@gmail.com

# Uniqueness Criteria for the Solution of Autonomous Differential Equations

### Abstract

The article considers the uniqueness of solutions of autonomous differential equations. The uniqueness and continuability of solutions Initial Value Problem (IVP) for functions whose zeros divide the number line into intervals where the sign of the function is constant and are determined

by the choice of the initial point on each interval are investigated. In studying the existence of a special decision to this type of differential equation, "one-sided" uniqueness was established depending on the given function and the location of its zeros in the coordinate plane. It is shown that the time it takes for the solution of the equation to pass from the neighborhood of the initial point to this point is determined by an improper integral. It has been studied that the violation of the uniqueness of the solution at the final moment of time is due to the fact that the improper integral converges and the impossibility of the solution coming to the equilibrium position is due to the fact that the improper integral diverges, there by preserving the uniqueness.

***Keywords:*** *Autonomous differential equation, the existence and uniqueness of the solution, Lipschitz condition, particular solution, "one-sided" uniqueness, direction fields, integral curve, phase portrait*

## Giriş

Avtonom diferensial tənliklərin həllinin varlığı və yeganəliyi, onun həndəsi, mexaniki və analitik həlli bir cox müəlliflər tərəfindən araşdırılmışdır (Astaşova, 2012). Göstərilmişdir ki, sonlu sayda sıfırları olan tənliklərdə istiqamətlər meydanı $y = a_k$ xətlərinə nəzərən üfüqidir. Həllin varlığı və yeganəliyi teoreminə əsasən müstəvinin hər bir nöqtəsindən yalnız bir inteqral əyrisi keçir və deməli, digər inteqral əyriləri $y = a_k$ düz xəttini kəsmir (Bufetov, Qonçaruk, İlyaşenko, 2019).

**Tədqiqat**

Düz xətt üzərində $y' = f(y)$ avtonom diferensial tənliyinə baxaq. Fərz edək ki, $f(y) \in C^1(R)$ funksiyası $a_1 < a_2 < \cdots < a_n$ nöqtəsində sonlu sayda sıfırlara malikdir. Bu zaman $y' = f(y)$ tənliyinin istiqamətlər meydanı $y = a_k$ xəttinə nəzərən üfüqidir, belə ki, $y(a_k) = 0$. Ona görə də $\{y = a_k\}$ xətləri inteqral əyriləri ailəsinə daxil olur. Həllin varlığı və yeganəliyi teoreminə əsasən müstəvinin hər bir nöqtəsindən tənliyin yalnız və yalnız bir inteqral əyrisi keçir: deməli, digər inteqral əyriləri $\{y = a_k\}$ xətləri ilə kəsişə bilməz. Ona görə də inteqral əyriləri tamamilə $\Pi_k = \{a_k < y < a_{k+1}\} \subset R^2$ zolağında və yaxud $\Pi_0 = \{y < a_0\}$, $\Pi_n = \{y > a_n\}$ yarım-müstəvilərin birində yerləşir. Qeyd edək ki, $f(y)$ funksiyası öz sıfırları arasında işarəsini dəyişmir. Fərz edək ki, $f(y)$ funksiyası $y \in (a_k, a_{k+1})$ olduqda müsbətdir. Onda $\Pi_k$ zolağında istiqamətlər meydanının xətləri müsbət bucaq altında meyl edir və $\Pi_k$-da olan ixtiyari inteqral əyrisi yuxarıya doğru yönəlmiş olur. Başqa sözlə $a_k$ və $a_{k+1}$ arasında yerləşən ixtiyari həll üçün $y(x) = f\big(y(x)\big) > 0$ olur, ona görə də bu həllər monoton artandır (Paşayeva S, Veysova S. 2024: səh. 150-155). Zolağın sərhəddinə yaxın hissədə $f(y)$ funksiyası kiçilir, ona görə də bu hissədə istiqamətlər meydanı demək olar ki, üfüqidir və inteqral əyrisinin dönmə bucağı kiçilir. Belə ki, inteqral əyrisi $\Pi_k$ zolağının sərhəddini kəsə bilmir və beləliklə, $\{y = a_{k+1}\}$ xəttinin sağ tərəfiylə və $\{y = a_k\}$ xəttinin isə sol tərəfiylə sonsuzluğa yaxınlaşır (Astaşova, Nikişin, 2010).

$$\lim_{x\to+\infty} y(x) = a_{k+1}, \quad \lim_{x\to-\infty} y(x) = a_k \tag{1}$$

Analoji hökm $a_k$ və $a_{k+1}$ sıfırları arasında $f(y)$ funksiyasının mənfi olan halı üçün də doğrudur. Yəni, bu halda inteqral əyriləri aşağı yönəlmiş olur və

$$\lim_{x\to+\infty} y(x) = a_k, \quad \lim_{x\to-\infty} y(x) = a_{k+1}. \tag{2}$$

Qeyd etmək lazımdır ki, əgər $y(x)$ avtonom diferensial tənliyin həllidirsə, onda $y(x+C)$ də bu tənliyin həllidir. Başqa sözlə avtonom diferensial tənliyin inteqral əyrisi $x \to x + C$ yerdə-yişməsində ümumi inteqral əyrisinə keçir. Deməli, $\Pi_k$ zolağında müxtəlif inteqral əyrisi $Ox$ oxu boyunca yerdəyişmədə digər inteqral əyrisindən fərqlənir .

Fərz edək ki, $f(y)$ funksiyası hər hansı bir intervalda təyin olunmuşdur və kəsilməzdir. $y' = f(y)$ tənliyi $x_0$ nöqtəsinin yaxın ətrafında $y(x_0) = y_0$ şərtini ödəyən həlli var və bu həll yeganədir; $f(y_0) \neq 0$ olduqda verilmiş həll $x - x_0 = \int_{y_0}^{y(x)} \frac{ds}{f(s)}$ inteqralı ilə müəyyən olunur (Veysova Paşayeva, 2024, s. 142-149). Bu hökm $y(x_0) = 0$ olduqda doğru deyil. Bu halda da verilmiş tənliyin həlli var: $y(x) \equiv y_0$ sabit funksiyası verilmiş tənliyi ödəyir, burada yalnız tənliyin $x_0$ başlanğıc şərtini ödəyən həllinin yeganəliyini tədqiq etmək qalır.

Göstərmək olar ki, $y' = f(y)$ tənliyinin həlli $y_0 \pm \varepsilon$ nöqtəsindən $y_0$ nöqtəsinə keçməsi üçün lazım olan zaman anı $\int_{y_0+\varepsilon}^{y_0} \frac{dy}{f(y)}$ qeyri-məxsusi inteqralına bərabərdir. Əgər $\int_{y_0+\varepsilon}^{y_0} \frac{dy}{f(y)}$ qeyri-məxsusi inteqral yığılandırsa onda verilmiş zaman anı sonludur və həllin yeganəliyi pozulur. Əgər qeyri-məxsusi inteqral dağılandırsa onda tənliyin həlli sonlu zaman fasiləsində tarazlıq halına keçə bilmir və həllin yeganəliyi saxlanılır. Beləliklə, aşağıdakı təklifin doğruluğu alınır (Serqeev, 2015, s. 95).

**Təklif.** Fərz edək ki, $f(y)$ funksiyası kəsilməzdir və $y_0$ nöqtəsində izolə olunmuş sıfıra malikdir: $f(y_0) = 0$ və $y_0$ nöqtəsinin $(y_0 - \varepsilon, y_0) \cup (y_0, y_0 + \varepsilon)$ ətrafında $f(y) \neq 0$.

1. Fərz edək ki,

$$\int_{y_0-\varepsilon}^{y_0} \frac{dy}{f(y)}, \quad \int_{y_0}^{y_0+\varepsilon} \frac{dy}{f(y)} \tag{3}$$

inteqrallarının hər ikisi dağılandır. Onda $y(x) \equiv y_0$ həlli

$$y' = f(y) \tag{4}$$

$$y(x_0) = y_0 \tag{5}$$

Koşi məsələsinin yeganə həllidir.

2. Əgər (3) inteqrallarından heç olmasa biri yığılandırsa onda Koşi məsələsinin sonsuz sayda həlli var.

(1), (2) ifadələrini ciddiyyəti və avtonom diferensial tənliklər üçün Koşi məsələsinin həllinin yeganəliyi aşağıdakı teoremlərlə əsaslandırılır (Bufetov, Qonçaruk, İlyaşenko, 2019).

**Teorem 1.** $y' = f(y)$ avtonom diferensial tənliyi verilmişdir və $f(y)$ funksiyası D oblastında kəsilməzdir yəni, $f(y) \in C_{(D)}$, $D \subset R$. Əgər $f(c) = 0$ olarsa, onda $y = c$ həllinin məxsusi həll olması üçün $\int_{y_0}^{c} \frac{dy}{f(y)}$ qeyri-məxsusi inteqralının yığılan olması zəruri və kafidir.

Burada $y_0$ elə bir nöqtədir ki, $(y_0, c)$ intervalında $f(y)$ funksiyası öz işarəsini saxlayır. Yəni, $y_0$ və $c$ arasında $f(y)$ funksiyasının başqa sıfırları yoxdur.

**Teorem 2.** Fərz edək ki, kəsilməz $f(y)$ funksiyası sonlu və ya sonsuz $\{a_k\}$ diskret sıfırlara malikdir və bütün

$$\int_{a_k-\varepsilon}^{a_k} \frac{dy}{f(y)}, \quad \int_{a_k}^{a_k+\varepsilon} \frac{dy}{f(y)} \tag{6}$$

qeyri-məxsusi inteqralları dağılandır. Onda (4), (5) Koşi məsələsinin $\forall y_0 \in R$ üçün yeganə həlli var. Bundan əlavə:

**1)** Fərz edək ki, $a_k$ və $a_{k+1}$ verilmiş $f(y)$ funksiyasının iki qonşu sıfırlarıdır və $a_k < y_0 < a_{k+1}$. Onda $y(x_0) = y_0$ başlanğıc şərtinə malik olan $y(x)$ həlli bütün $x$-lar üçün təyin olunmuşdur. Əgər $(a_k, a_{k+1})$ intervalında $f(y) > 0$ olarsa, onda $y(x)$ monoton olaraq artır və

$$\lim_{x\to+\infty} y(x) = a_{k+1}, \quad \lim_{x\to-\infty} y(x) = a_k .$$

$(a_k, a_{k+1})$ intervalında $f(y) < 0$ olarsa, onda $y(x)$ monoton olaraq azalır və $\lim_{x\to-\infty} y(x) = a_{k+1}, \quad \lim_{x\to+\infty} y(x) = a_k$.

**2)** Fərz edək ki, $(a_n, +\infty)$ intervalında $f(y) > 0$ və $y_0 > a_n$. Onda $y(x_0) = y_0$ başlanğıc şərtini ödəyən $y(x)$ həlli monoton olaraq artır və $\lim_{x\to-\infty} y(x) = a_n$ ödənir.

**2a)** Əgər $y_0 > a_k$ olduqda $\int_{y_0}^{+\infty} \frac{dy}{f(y)}$ qeyri–məxsusi inteqralı dağılandırsa, tənliyin həlli bütün $x$-lar üçün təyin olunmuşdur və $\lim_{x\to+\infty} y(x) = +\infty$.

**2b)** Əgər bu inteqral yığılandırsa, onda tənliyin $y(x)$ həlli $\forall x < c$ şüasında təyin olunmuşdur və $\lim_{x\to c-0} y(x) = +\infty$.

**Məsələnin qoyuluşu və həlli.**

Məqalədə

$$y' = f(y), \quad f(y) = \begin{cases} f_1(y), & y \ge 0 \\ f_2(y), & y < 0 \end{cases} \tag{7}$$

$$y(x_0) = y_0 \tag{8}$$

tipli avtonom diferensial tənlyin həllinin yeganəlik meyarı tədqiq edilmişdir.

(7) tənliyinin sağ tərəfindəki $f(y)$ funksiyası $D \subset R$ oblastında kəsilməzdir, yəni $f(y) \in C_{(D)}$. Əvvəlcə (7) tənliyinin xüsusi halı olan

$$y' = f(y) = \begin{cases} g(y), & y > 0 \\ 0, & y = 0 \end{cases} \tag{7*}$$

$$y(x_0) = y_0 \tag{8*}$$

avtonom diferensial tənliyinin yeganəlik meyarına baxaq. Verilmiş (7*) tənliyinin sağ tərəfindəki $f(y)$ funksiyası $[0,+\infty)$ intervalında kəsilməzdir, yəni $f(y) \in C_{(D)}, D = [0,+\infty)$: $\lim_{y\to+0} f(y) = 0$ və $f(y)$ funksiyası Lipşits şərtini ödəmir (Denisov, 2018, s. 87). $f(y)$ funksiyasının verilmiş intervalda Lipşits şərtinin ödənilməsini fərz edək. Yəni, fərz edək ki, $\exists L > 0$ Lipşits sabiti var ki, $\forall y_1, y_2 \in [0,+\infty)$ üçün $|f(y_1) - f(y_2)| \le L|y_1 - y_2|$ şərti ödənsin (Petrovskiy, 2009). Lakin elə nöqtələr cütü tapaq ki, bu bərabərsizlik ödənməsin. Məlumdur ki, bu nöqtələrdən biri sıfır, digəri isə $[0,+\infty)$ yarım intervalından götürülmüş ixtiyari nöqtədir. Tutaq ki, $y_1 \in [0,+\infty)$, $y_2 = 0$. Bu halda

$$|f(y_1) - f(y_2)| = |f(y_1) - 0| = |f(y_1)| \le L|y_1 - 0| = L|y_1|$$

Yəni, $|f(y_1)| \le L|y_1|$. $\forall L$ üçün $\exists y_1^* \in (0,+\infty)$ var ki, $|f(y_1^*)| > L|y_1^*|$. Bu isə o deməkdir ki, $f(y)$ funksiyası Lipşits şərtini ödəmir.

Əgər $f(y) \ne 0$ olarsa, onda verilmiş tənliyin ümumi həlli

$$\frac{dx}{dy} = \frac{1}{f(y)} \quad \text{və} \quad y = \begin{cases} \varphi(x, C_1), & y > 0 \\ C_2, & y = 0 \end{cases}$$

şəklindədir. $f(y)=0$ olduqda tənlik sonlu sayda $y=a_k=0$ və $y=a_{k+1}$ sıfırlara malikdir. Bu həllərin hər biri üçün yeganəlik meyarını yoxlayaq. $y>0$ halında $y=a_k=0$ xəttindən aşağıda həllin varlığından danışmaq olmaz. $y=a_k=0$ və $y=a_{k+1}$ xətləri arasında $\exists y_0=a_k+\varepsilon$ nöqtəsi var ki, bu nöqtədən çıxan həllin $y=a_k=0$ və $y=a_{k+1}$ xətlərinə qədər davamlılığı mümkündür. Bundan əlavə $y=a_{k+1}$ xəttindən yuxarıda yəni $y_0^*=a_{k+1}+\varepsilon$ nöqtəsindən $y=a_{k+1}$ xəttinə qədər olan həlli də mümkündür (Balandin, Chudinov, 2008, pp. 5-15).

**1)** $y=a_k=0$ həllinə baxaq. Bu həllin yeganəliyi $y=a_k$ xəttindən yuxarıda yerləşən $y_0=a_k+\varepsilon$ nöqtəsindən bu xəttə qədər olan $\int_{y_0}^{0}\frac{dy}{f(y)}$ qeyri-məxsusi inteqralın yığılan və ya dağılan olmasından asılıdır. Əgər $\int_{y_0}^{0}\frac{dy}{f(y)}=\infty$ olarsa, onda $y=a_k=0$ həlli məxsusi həll deyil. Əgər $\int_{y_0}^{0}\frac{dy}{f(y)}<\infty$ olarsa, onda $y=a_k=0$ həlli məxsusi həlldir.

**2)** $y=a_{k+1}$ həllinin məxsusi həll olması $y=a_{k+1}$ xəttindən aşağıda yerləşən $\tilde{y}_0^*=a_{k+1}-\varepsilon$ nöqtəsindən bu xəttə qədər olan $\int_{\tilde{y}_0^*}^{a_{k+1}}\frac{dy}{f(y)}$ və $y=a_{k+1}$ xəttindən yuxarıda yerləşən $y_0^*=a_{k+1}+\varepsilon$ nöqtəsindən bu xəttə qədər olan $\int_{y_0^*}^{a_{k+1}}\frac{dy}{f(y)}$ qeyri-məxsusi inteqralının yığılan və ya dağılan olmasından asılıdır (Sabatulina T., Malygina V. 2014.—№ 61.—P. 1–16).

$\int_{\tilde{y}_0^*}^{a_{k+1}}\frac{dy}{f(y)}=\infty$ və ya $\int_{y_0^*}^{a_{k+1}}\frac{dy}{f(y)}=\infty$ olarsa, onda $y=a_{k+1}$ məxsusi həll deyil. Əgər $\int_{\tilde{y}_0^*}^{a_{k+1}}\frac{dy}{f(y)}<\infty$ və ya $\int_{y_0^*}^{a_{k+1}}\frac{dy}{f(y)}<\infty$ olarsa, onda $y=a_{k+1}$ məxsusi həllidir.

Avtonom diferensial tənliklər üçün həllin yeganəlik meyarını (7) tənliyinə tətbiq edək.

Verilmiş (7) tənliyinin sağ tərəfindəki $f(y)$ funksiyası $D\subset R$ intervalında kəsilməzdir, yəni $f(y)\in C_{(D)}$. Əgər $f(y)\neq 0$ olarsa, onda verilmiş tənliyin ümumi həlli

$$\frac{dx}{dy}=\frac{1}{f(y)} \text{ və } y=\begin{cases}\varphi(x,C_1), & y\geq 0\\ \psi(x,C_2), & y<0\end{cases}$$

şəklindədir. Əgər $f(y)=0$ olarsa, onda tənlik sonlu sayda $y=a_k=0$ və $y=a_{k+1}$ kimi sıfırlara malikdir. Teorem 1-ə əsasən $y=a_k=0$ həllinin məxsusi həll olması üçün $\int_{y_0}^{a_k}\frac{dy}{f(y)}$ qeyri-məxsusi inteqralının yığılan olması zəruri və kafidir. $y\geq 0$ halında inteqrallamanın $y_0$ aşağı sərhəddi olaraq $y=a_k=0$ xəttindən yuxarıda yerləşən $y_0=a_k+\varepsilon$ nöqtəsi götürülür. Bu halda $\int_{y_0}^{a_k}\frac{dy}{f(y)}$, $\int_{y_0}^{a_{k+1}}\frac{dy}{f(y)}$ və yaxud $\int_{y_0^*}^{a_{k+1}}\frac{dy}{f(y)}$ qeyri-məxsusi inteqrallarının yığılan və ya dağılan olması $y=a_k=0$ və $y=a_{k+1}$ xətləri vasitəsilə tənliyin həllinin yeganəlik meyarını müəyyən etməyə imkan verir. Əgər

$\int_{y_0}^{a_k} \frac{dy}{f(y)} = \infty$, $\int_{y_0}^{a_{k+1}} \frac{dy}{f(y)} = \infty$ və ya $\int_{y_0^*}^{a_{k+1}} \frac{dy}{f(y)} = \infty$ olarsa, yəni verilmiş qeyri-məxsusi inteqralları dağılandırsa, onda $y = a_k = 0$ və $y = a_{k+1}$ məxsusi həll deyil. (7) tənliyinin $y < 0$ şərtində $y = a_k = 0$ sıfırından başqa $y = a_k \neq a_i$ sıfırları da vardır. $y < 0$ halında inteqrallamanın $\tilde{y}_0$ aşağı sərhəddi olaraq $y = a_k = 0$ xəttindən aşağıda yerləşən $\tilde{y}_0 = a_k - \varepsilon$ nöqtəsi götürülür. Bu halda $\int_{\tilde{y}_0}^{a_k} \frac{dy}{f(y)}$ və $\int_{\tilde{y}_0}^{a_i} \frac{dy}{f(y)}$ qeyri-məxsusi inteqrallarının yığılan və ya dağılan olması $y = a_k = 0$ və $y = a_i$ xətləri vasitəsilə tənliyin həllinin yeganəlik meyarını müəyyən etməyə imkan verir. Əgər $\int_{\tilde{y}_0}^{a_k} \frac{dy}{f(y)} = \infty$ və $\int_{\tilde{y}_0}^{a_i} \frac{dy}{f(y)} = \infty$ olarsa, yəni verilmiş qeyri-məxsusi inteqrallar dağılandırsa, onda $y = a_k = 0$ məxsusi həll deyil (Pantryaqin, 1986).

Xüsusi maraq kəsb edən iki əsas faktı qeyd etmək olar. $y \geq 0$ və $y < 0$ halında (7) tənliyinin sağ tərəfindəki $f_1(y)$ və $f_2(y)$ funksiyaları üçün $y = a_k = 0$ tənliyin ortaq sıfırıdır. Bu halda $y = a_k = 0$ xəttindən uyğun olaraq yuxarıda və aşağıda götürülmüş $y_0 = a_k + \varepsilon$ və $\tilde{y}_0 = a_k - \varepsilon$ nöqtələrindən bu xəttə qədər olan $\int_{y_0}^{a_k} \frac{dy}{f(y)}$ və ya $\int_{\tilde{y}_0}^{a_k} \frac{dy}{f(y)}$ qeyri-müəyyən inteqrallarının sonlu limiti varsa, o zaman $y = a_k = 0$ məxsusi həllidir. Burada iki hal mümkündür (Balandin, Sabatulina, 2017, s. 26–37).

$$1) \quad \underset{y_0>0}{\int_{y_0}^{a_k}} \frac{dy}{f(y)} < \infty \quad \text{və} \quad \underset{\tilde{y}_0<0}{\int_{\tilde{y}_0}^{a_k}} \frac{dy}{f(y)} = \infty$$

$$2) \quad \underset{y_0>0}{\int_{y_0}^{a_k}} \frac{dy}{f(y)} = \infty \quad \text{və} \quad \underset{\tilde{y}_0<0}{\int_{\tilde{y}_0}^{a_k}} \frac{dy}{f(y)} < \infty$$

Hər iki halda $y = a_k = 0$ xəttində "birtərəfli" yeganəlik müşahidə olunur. $y \geq 0$ halında (7) tənliyinin sağ tərəfindəki $f_1(y)$ funksiyası üçün

$$x(y) = x_0 + \int_{y_0}^{y} \frac{dy}{f_1(y)} \Rightarrow \quad x(y) = x_0 + F_1(y)$$

yazmaq olar. Burada $F(y) = \int_{y_0}^{y} \frac{dy}{f_1(y)}$ və $x'(y) = F_1'(y)$ olduğundan $\frac{dy}{dx} = \frac{1}{F_1'(y)}$.

Digər tərəfdən

$$\frac{dy}{dx} = f_1(y) \Rightarrow f_1(y) = \frac{1}{F_1'(y)} \Rightarrow F_1'(y) = \frac{1}{f_1(y)} > 0, \; y \in (a_k, a_{k+1})$$

$F_1(y)$ funksiyası $y \in (a_k, a_{k+1})$ intervalında monoton artandır. Deməli, $y(x) = F_1^{-1}(x - x_0)$ verilmiş (7) tənliyinin $y \geq 0$ olduqda həllidir. Burada $F_1^{-1}$ funksiyası $F_1(y)$ funksiyasının tərsidir. $\int_{y_0}^{a_k} \frac{dy}{f_1(y)} = \infty$ şərti daxilində (7) tənliyinin $y \geq 0$ halı üçün $y \to a_k + 0$ olduqda limitə keçək:

$$\lim_{y\to a_k+0} x(y) = \lim_{y\to a_k+0}\left[x_0 - \int_{y_0}^{a_k}\frac{dy}{f_1(y)}\right] = -\infty$$

Buradan görünür ki, $\lim\limits_{y\to-\infty} y(x) = \lim\limits_{y\to-\infty} F_1^{-1}(x-x_0) = a_k+0$, yəni $y=y(x)$ həlli $(-\infty,\ x_0]$ yarım-oxu boyunca sola doğru davam edir (Belyayev, 2009, s. 3-11). Əgər $\int_{y_0}^{a_k}\frac{dy}{f_1(y)} < \infty$ olarsa, onda

$$\lim_{y\to a_k+0} x(y) = \lim_{y\to a_k+0}\left[x_0 - \int_{y_0}^{a_k}\frac{dy}{f_1(y)}\right] \overset{def}{=} \bar{x} < x_0$$

$$\lim_{x\to\bar{x}+0} y(x) = a_k+0 \Rightarrow y = a_k .$$

Oxşar qayda ilə $y<0$ halında (7) tənliyinin sağ tərəfindəki $f_2(y)$ funksiyası üçün həllin yeganəlik meyarı təhlil edilir. $\int_{\tilde{y}_0}^{a_k}\frac{dy}{f_2(y)} = \infty$ şərti daxilində (7) tənliyinin $y<0$ halı üçün $y\to a_k-0$ olduqda limitə keçsək:

$$\lim_{y\to a_k-0} x(y) = \lim_{y\to a_k-0}\left[x_0 - \int_{\tilde{y}_0}^{a_k}\frac{dy}{f_2(y)}\right] = +\infty$$

alarıq. Buradan görünür ki, $\lim\limits_{y\to-\infty} y(x) = \lim\limits_{y\to-\infty} F_2^{-1}(x-x_0) = a_k-0$, yəni $y=y(x)$ həlli $[x_0,+\infty)$ yarımoxu boyunca sağa doğru davam edir. Əgər $\int_{\tilde{y}_0}^{a_k}\frac{dy}{f_2(y)} < \infty$ olarsa, onda

$$\lim_{y\to a_k-0} x(y) = \lim_{y\to a_k-0}\left[x_0 - \int_{\tilde{y}_0}^{a_k}\frac{dy}{f_2(y)}\right] \overset{def}{=} \bar{x} > x_0$$

$$\lim_{x\to\bar{x}-0} y(x) = a_k - 0$$

Onda $y=y(x)$ həllini məxsusi həllinə qədər davam etdirmək olar. Məhz

$$y = \begin{cases} y(x), & x\in[\bar{x}, x_0] \\ a_k, & x\in(-\infty,\bar{x}) \end{cases}$$

funksiyası (7) Koşi məsələsinin $(-\infty, x_0]$ yarımoxunda davamedən həllidir.

Şəkildə göstərilən faza portretindən görünür ki, tarazlıq vəziyyətinin yaxın ətrafında tənliyin həlli özünü aşağıdakı mümükün halların birinə uyğun olaraq aparır (Bufetov, Qonçaruk, İlyaşenko, 2019).




***Şəkil.*** *Avtonom diferensial tənliyin inteqral və faza əyriləri*

1. Əgər hər iki ən yaxın ox $a_k$ nöqtəsinə yönəldilmişdirsə, başlanğıc şərtləri $a_k$ -ya yaxın olan həllər, $x \to +\infty$ olduqda $a_k$ -ya yaxınlaşır. Onda həllin bu halda tarazlıq vəziyyəti dayanıqlı olur.

2. Əgər hər iki ən yaxın ox $a_k$ nöqtəsindən kənara yönəldilmişdirsə, onda başlanğıc şərtləri $a_k$ -ya yaxın olan həllər əvvəlcə $x \to -\infty$ olduqda $a_k$ -ya yaxınlaşır və sonradan isə $a_k$ -dan uzaqlaşırlar. Belə bir tarazlıq vəziyyəti dayanıqsızdır.

3. Əgər ən yaxın iki oxdan biri $a_k$ -ya doğru, digəri isə ondan əks tərəfə yönələrsə, onda başlanğıc şərtləri $a_k$ -ya yaxın olan həllərdən biri əvvəlcə, digəri isə sonradan $a_k$ -ya yaxınlaşır. Belə bir tarazlıq vəziyyəti yarım dayanıqlıdır.

## Nəticə

Sağ tərəfi kəsilməz funksiya olan xüsusi tipli avtonom diferensial tənliklərin həllinin varlığı və yeganəliyi tədqiq edilmişdir. Məlum olmuşdur ki, ixtiyari başlanğıc şərtlər daxilində baxılan tip tənliyin həlli var və bu həll həmişə yeganə deyil. Məlum teoremə əsasən həllin varlığı və yeganəliyi üçün kafi şərt, verilmiş diferensial tənliyin sağ tərəfindəki funksiyanın Lipşits şərtini ödəməsidir. Verilmiş tənliyinin sağ tərəfindəki funksiyanın xüsusi halında həllin yeganəliyi üçün kafı şərtin ödənilməsi yoxlanılmışdır. Nəticələr göstərir ki, tənliyin həllinin başlanğıc nöqtənin yaxın ətrafından bu nöqtəyə keçməsi üçün zəruri zaman anını müəyyən edən qeyri-məxsusi inteqral dağılandır. Bu zaman inteqral əyriləri asimptotik olaraq $y = a_k$ xəttinə yaxınlaşır, lakin bu xəttə çatmır. Bu isə verilmiş diferensial tənliyin həllinin yeganəliyini təsdiq edir. $y = a_k$ xətti verilmiş tənliyin analitik ifadəsinin hər iki $y \geq 0$ və $y < 0$ halı üçün ortaq sıfırı olduğundan bu xəttin digər tərəfində başlanğıc nöqtənin yaxın ətrafından bu nöqtəyə keçməsini ifadə edən qeyri-məxsusi inteqralın yığılan olması müşahidə olunur. Bu zaman inteqral əyrisi $y = a_k$ xəttinə çatır və həllin yeganəliyi pozulur. Beləliklə, $y = a_k$ xətti "birtərəfli" yeganəlik halını özündə saxlayır ki, bu da $y = a_k$ xəttinin verilmiş tənliyin təyin oblastının sərhəddində yerləşdiyi üçün deyil, bu xəttin yaxın ətrafında $f(y)$ funksiyasının Lipşits şərtini ödəməməsi ilə izah olunur.

Aparılan tədqiqat xüsusi tipli avtonom diferensial tənliklərin həlli üçün tarazlıq vəziyyətinin yaxın ətrafında uyğun faza portiretini qurmağa və bu tarazlıq vəziyyətinin dayanıqlığı haqqında apriori qiymətləndirmə aparmağa imkan verir.

## Ədəbiyyat

1. Astaşova, İ. V. (2012). *Differensialnıe uravneniya*. Nauka.
2. Astaşova, İ. V., & Nikişin, V. A. (2010). *Praktikum po kursu "Differensialnıe uravneniya"*. MESİ.
3. Balandin, A. S., & Chudinov, K. M. (2008). On the asymptotic behavior of linear autonomous functional differential equations of neutral type. *Functional Differential Equations, 15*(1–2), 5–15.
4. Balandin, A. S., & Sabatulina, T. L. (2017). Razreşimost avtonomnogo differensialnogo uravneniya s posledeystviem na otritsatel'noy poluosi. *Izvestiya Vysshikh Uchebnykh Zavedeniy. Matematika*, (10), 26–37.
5. Belyayev, S. A. (2009). Počti prodolzhimost' resheniy differensial'nykh uravneniy. *Matematicheskie Zametki, 85*(1), 3–11. https://doi.org/10.4213/mzm4167
6. Bufetov, A. İ., Qonçaruk, N. B., & İlyaşenko, Y. S. (2019). *Obiknovennıe differensialnıe uravneniya*.
7. Denisov, A. M. (2018). *Differensialnıe uravneniya. Leksii. Cast' 1-ya*. VMK MQU.
8. Paşayeva, S. T., & Veysova, S. Ə. (2024). Adi diferensial tənliklərin məxsusi həllinin varlığı. *Elmi İş: Beynəlxalq Elmi Jurnal, 18*(12), 150–155. https://doi.org/10.36719/2663-4619/109/150-155

9. Petrovskiy, İ. Q. (2009). *Leksii po teorii obıknovennıx differensialnıx uravneniy*. Nauka.
10. Pontryaqin, L. S. (1986). *Obıknovennıe differensialnıe uravneniya*. Nauka.
11. Sabatulina, T., & Malygina, V. (2014). On positiveness of the fundamental solution for a linear autonomous differential equation with distributed delay. *Electronic Journal of Qualitative Theory of Differential Equations*, (61), 1–16.
12. Serqeev, İ. N. (2015). *Differensialnıe uravneniya. Cast' 1-ya*. Mexmat, MQU im. M. V. Lomonosova.
13. Veysova, S. Ə., & Paşayeva, S. T. (2024). Adi diferensial tənliklərin Pikar üsulu ilə həllində xətaların qiymətləndirilməsi. *Elmi İş: Beynəlxalq Elmi Jurnal, 18*(12), 142–149. https://doi.org/10.36719/2663-4619/109/142-149

Daxil oldu: 12.02.2025
Qəbul edildi: 17.06.2025

**TEXNİKA ELMLƏRİ**

**TECHNICAL SCIENCES**

DOI: https://doi.org/10.36719/2663-4619/119/83-88

**Mirsadi Mustafayev**
National Aviation Academy
PhD student
https://orcid.org/0009-0000-5766-7939
mirsedimustafayev@gmail.com

# Synthesis of Organic Semiconducting Thin Films and Their Prospects in Flexible Sensor Technologies

**Abstract**

This study investigates the synthesis of pure hydrogel films based on the organic semiconductor material PEDOT:PSS and their potential application in flexible sensor devices. Through a controlled drying and rehydration process facilitated by the addition of dimethyl sulfoxide (DMSO), the resulting films exhibit high electrical conductivity (~20–40 S/cm), excellent elasticity (>35%), and strong biocompatibility. These films also demonstrate a low Young's modulus (~2 MPa) and high water content, ensuring mechanical durability in physiological environments. These combined properties make PEDOT:PSS hydrogel films promising candidates for next-generation flexible and biointegrated sensor technologies.

***Keywords:*** *semiconductors, synthesis, sensors, flexibility, polymers*

**Mirsədi Mustafayev**
Milli Aviasiya Akademiyası
doktorant
https://orcid.org/0009-0000-5766-7939
mirsedimustafayev@gmail.com

# Üzvi yarımkeçirici nazik təbəqələrin sintezi və onların perspektivləri çevik sensor texnologiyalarında

**Xülasə**

Bu tədqiqat, üzvi yarımkeçirici material olan PEDOT:PSS əsasında saf hidrogel təbəqələrinin sintezini və onların çevik sensor qurğularında tətbiq potensialını araşdırır. Dimetilsulfoksid (DMSO) əlavəsi ilə aparılan nəzarətli qurudulma və rehidrasiya prosesi nəticəsində əldə edilən təbəqələr yüksək elektrik keçiriciliyi (~20–40 S/sm), əla elastiklik (>35%) və güclü biouyğunluq nümayiş etdirir. Bu təbəqələr, həmçinin aşağı Yununq modulu (~2 MPa) və yüksək su tərkibi ilə seçilərək fizioloji mühitdə mexaniki davamlılığı təmin edir. Bu xüsusiyyətlərin birgə təsiri PEDOT:PSS əsaslı hidrogel təbəqələrini növbəti nəsil çevik və biointeqrasiya olunmuş sensor texnologiyaları üçün perspektivli namizədə çevirir.

***Açar sözlər:*** *yarımkeçiricilər, sintez, sensorlar, elastiklik, polimerlər*

## Introduction

In the 21st century, one of the main frontiers of scientific and technological progress is the advancement of flexible and wearable electronic devices. Developments in this area have enabled a broad spectrum of applications, including medical diagnostics, human-machine interfaces, artificial

 

skin, environmental sensing and bioelectronic platforms. For these systems to function effectively and consistently, the materials involved must combine excellent electrical conductivity with mechanical flexibility. Conventional inorganic semiconductors—such as silicon (Si), gallium arsenide (GaAs) and indium tin oxide (ITO)—fall short of these requirements due to their rigid and brittle nature and limited biocompatibility. In response, organic semiconductors, particularly conjugated polymers like PEDOT:PSS (poly(3,4-ethylenedioxythiophene):polystyrene sulfonate) and polyaniline, have gained prominence as viable alternatives (Liu, 2012; Chen et al., 2003). Their conjugated structures facilitate charge delocalization, contributing to high conductivity, while their inherent flexibility supports the development of durable, bendable thin films (Li et al., 2023). Additionally, their ability to be processed in water-based solutions, fabricated at low temperatures, and integrated into transparent electronic systems enhances their suitability for modern manufacturing techniques. Their compatibility with biological systems further makes them ideal for use in implantable devices and neural interfaces that require direct interaction with living tissues (Yue et al., 2011; Bell, 2008).

Despite these advantages, producing high-performance thin films from organic semiconductors poses significant challenges. Issues such as suboptimal conductivity, structural defects, limited mechanical strength, and long-term instability persist. To mitigate these drawbacks, researchers have explored methods including chemical doping, molecular design modifications, and optimized drying techniques (He et al., 2013; Bubnova et al., 2012). A particularly effective strategy for enhancing PEDOT:PSS performance involves the use of polar solvents—especially dimethyl sulfoxide (DMSO)—to create hydrogel-based pure thin films. This technique allows for the development of highly conductive, flexible, and water-retentive structures (Tritt et al., 2006). In this study, dimethyl sulfoxide (DMSO), a polar co-solvent with a high boiling point, was incorporated into an aqueous PEDOT:PSS solution as a functional additive. DMSO facilitates the recrystallization of PEDOT-rich nanofibrils and promotes the reorganization of PEDOT:PSS polymer chains during the dry-annealing phase. Crucially, both water and DMSO are entirely eliminated through an extensive drying process (24 hours at 60 °C), followed by three annealing cycles at 130 °C for 30 minutes each. This processing method leads to the formation of pure PEDOT:PSS hydrogel films. Notably, (Chen et al., 2003) introduced an innovative approach based on sequential drying and rehydration, producing films that are not only mechanically soft and compliant but also maintain electrical stability. These films exhibited favorable characteristics such as a low Young’s modulus (~2 MPa), high water content (>80%), biocompatibility, and sustained structural robustness—traits that render them well-suited for emerging biointegrated sensor technologies (Venkatasubramanian et al.,). The present research investigates the synthesis of such materials, assesses their physicochemical and electrical characteristics, and explores their suitability for use in flexible sensor devices. The main goal is to evaluate the potential of PEDOT:PSS-based thin films as functional components in advanced sensor systems and to contribute foundational insights for their continued development and practical deployment (Dubey et al.; Bubnova et al., 2011).



**Fig. 1.** Dry-Annealing and Swelling Characteristics of Pure PEDOT:PSS Hydrogels.
a. Schematic depiction of isotropic dry-annealing of aqueous PEDOT:PSS solution resulting in a microball formation.
b. Schematic representation of anisotropic dry-annealing producing a free-standing film from aqueous PEDOT:PSS solution.
c. Experimental images showing the isotropic dry-annealing process leading to the formation of a microball.
d. Experimental images demonstrating anisotropic dry-annealing that yields a free-standing film.
e. Isotropic swelling behavior of a dry-annealed PEDOT:PSS microball transitioning into a stable hydrogel state.
f. Anisotropic swelling of a free-standing PEDOT:PSS film into a structurally stable hydrogel.
g, h. Time-dependent dimensional variations observed during g isotropic and h anisotropic dry-annealing of aqueous PEDOT:PSS.
i, j. Time-course analysis of dimensional changes during i isotropic and j anisotropic swelling of the resulting pure PEDOT:PSS hydrogels. Data in panels g–j are presented as means, with error bars indicating standard deviation (n = 3). Scale bars represent 1 mm.

**Research**

This study aims to fabricate pure hydrogel thin films based on PEDOT:PSS that exhibit both high electrical conductivity and mechanical durability, while also evaluating their suitability for use in flexible bioelectronic sensors (Yue R., Xu J.,2012), (Poehler T. O., Katz & H. E., 2012). To modify the properties of the PEDOT:PSS solution, varying concentrations of dimethyl sulfoxide (DMSO) were introduced. The prepared samples underwent a three-stage drying process: an initial 24-hour drying period at 60 °C, followed by three annealing cycles of 30 minutes each at 130 °C. After drying, the films were rehydrated to form hydrogel structures. The final hydrogel films were then analyzed to assess their electrical conductivity, mechanical flexibility, and structural characteristics.




**Fig. 2.** Mechanical and Electrical Properties of Pure PEDOT:PSS Hydrogels
a. Representative nominal stress–strain curves for free-standing PEDOT:PSS hydrogels immersed in PBS, measured at different concentrations of DMSO.
b. Variation in Young's modulus and maximum tensile strain of the hydrogels as a function of DMSO concentration in PBS.
c. Electrical conductivity of PEDOT:PSS hydrogels measured in both deionized water and PBS across a range of DMSO concentrations.
d. Conductivity profiles of the hydrogels under different applied strains, evaluated in deionized water and PBS.
e. Cyclic voltammetry (CV) curves of the PEDOT:PSS hydrogel-coated platinum (Pt) electrode in PBS. For comparison, the CV curve of an uncoated (bare) Pt electrode is shown in red.
f. Cyclic current response of the PEDOT:PSS hydrogel-coated Pt electrode under repetitive voltage pulses ranging from −1.5 V to +1.5 V (vs. Ag/AgCl reference).
Data in panels **b–d** are reported as mean values, with error bars representing standard deviations (n = 4).

**Table 1.**
**Properties of PEDOT:PSS films according to DMSO concentration.**

| DMSO (%) | Conductivity (S/cm, PBS) | Conductivity (S/cm, water) | Young's Modulus (MPa) | Strain at Break (%) |
|---|---|---|---|---|
| 5 | ~8 | ~14 | 10 | 20 |
| 13 | ~20 | ~40 | 2 | 35 |
| 20 | ~18 | ~36 | 3 | 32 |
| 33 | ~10 | ~25 | 4 | 28 |
| 50 | ~5 | ~10 | 5 | 22 |

The best performance was observed when the DMSO concentration reached 13%. Under these conditions, the resulting films achieved electrical conductivities of approximately 20 S/cm in phosphate-buffered saline (PBS) and about 40 S/cm in water. In terms of mechanical properties, the films showed remarkable elasticity, with a Young's modulus of 2 MPa and a strain at break of 35%, indicating strong compatibility with soft biological tissues. Notably, the films preserved both their conductivity and structural integrity for up to three months, demonstrating excellent long-term stability. Additionally, variations in swelling behavior between isotropic and anisotropic drying techniques—such as calibration and template printing—further support the versatility of these films in different sensor manufacturing processes. Overall, this study marks a significant step forward in developing PEDOT:PSS-based hydrogel thin films that combine superior conductivity with mechanical resilience, confirming their potential for integration into flexible bioelectronic sensors. The results offer important perspectives for advancing research in material science, biotechnology, and sensor technologies.

## Conclusion

This study has shown that pure PEDOT:PSS-based hydrogel films hold significant promise as organic semiconductors for use in flexible sensor technologies. The incorporation of dimethyl sulfoxide (DMSO) during the synthesis process greatly improves the films' electrical conductivity, mechanical flexibility, and stability in aqueous environments. These enhanced characteristics make PEDOT:PSS hydrogels particularly well-suited for practical applications in implantable bioelectronics, skin-mounted sensors, and neural interface devices. Their high elasticity allows them to closely mimic the mechanical behavior of human skin and tissues, improving comfort and reducing the risk of tissue irritation or damage during prolonged use. Moreover, their water resistance ensures consistent performance in humid and physiologically relevant conditions, which is essential for dependable biomedical sensing. Future investigations should aim to produce these materials in various micro- and nanoscale structures by leveraging advanced manufacturing techniques such as inkjet and 3D printing, enabling the creation of highly precise and customizable sensors. Additionally, chemical functionalization of PEDOT:PSS hydrogels could further enhance their biocompatibility, molecular selectivity, and responsiveness to specific biological stimuli. These innovations would support the development of more sophisticated and multifunctional bioelectronic platforms. In conclusion, PEDOT:PSS-based hydrogel films represent a highly promising class of materials for the next generation of flexible, high-performance, and long-lasting sensor systems. This research also contributes to the refinement of scalable and efficient fabrication approaches for organic semiconductors, opening up new possibilities for their broader industrial adoption.

## References

1. Bell, L. E. (2008). Cooling, heating, generating power, and recovering waste heat with thermoelectric systems. *Science*, *321*(5895), 1457–1461. https://doi.org/10.1126/science.1158899
2. Bubnova, O., & Crispin, X. (2012). Towards polymer-based organic thermoelectric generators. *Energy & Environmental Science*, *5*(10), 9345–9362. https://doi.org/10.1039/C2EE22474D
3. Chen, G., Dresselhaus, M. S., Dresselhaus, G., Fleurial, J. P., & Caillat, T. (2003). Recent developments in thermoelectric materials. *International Materials Reviews, 48*(1), 45–66. https://doi.org/10.1179/095066003225010182
4. Dubey, N., & Leclerc, M. (2011). Conducting polymers: Efficient thermoelectric materials. *Journal of Polymer Science Part B: Polymer Physics, 49*(6), 467–475. https://doi.org/10.1002/polb.22218
5. He, M., Qiu, F., & Lin, Z. (2013). Towards high-performance polymer-based thermoelectric materials. *Energy & Environmental Science, 6*(4), 1352–1361. https://doi.org/10.1039/C3EE00052J

6. Liu, W., Yan, X., Chen, G., & Ren, Z. (2012). Recent advances in thermoelectric nanocomposites. *Nano Energy*, *1*(1), 42–56. https://doi.org/10.1016/j.nanoen.2011.10.001
7. Mateeva, N., Niculescu, H., Schlenoff, J., & Testardi, L. R. (1998). Correlation of Seebeck coefficient and electric conductivity in polyaniline and polypyrrole. *Journal of Applied Physics, 83*(6), 3111–3117. https://doi.org/10.1063/1.367122
8. Poehler, T. O., & Katz, H. E. (2012). Prospects for polymer-based thermoelectrics: State of the art and theoretical analysis. *Energy & Environmental Science*, *5*(21), 8110–8115. https://doi.org/10.1039/C2EE22058D
9. Snyder, G. J., & Toberer, E. S. (2008). Complex thermoelectric materials. *Nature Materials, 7*(2), 105–114. https://doi.org/10.1038/nmat2090
10. Tritt, T. M., & Subramanian, M. A. (2006). Thermoelectric materials, phenomena, and applications: A bird's eye view. *MRS Bulletin, 31*(3), 188–198. https://doi.org/10.1557/mrs2006.44
11. Venkatasubramanian, R., Siivola, E., Colpitts, T., & O'Quinn, B. (2001). Thin-film thermoelectric devices with high room-temperature figures of merit. *Nature, 413*(6856), 597–602. https://doi.org/10.1038/35098012
12. Yue, R., & Xu, J. (2012). Poly(3,4-ethylenedioxythiophene) as promising organic thermoelectric materials: A mini-review. *Synthetic Metals, 162*(11–12), 912–917. https://doi.org/10.1016/j.synthmet.2012.04.012
13. Yue, R., Chen, S., Lu, B., Liu, C., & Xu, J. (2011). Facile electrosynthesis and thermoelectric performance of electroactive free-standing polythieno[3,2-b]thiophene films. *Journal of Solid State Electrochemistry, 15*(3), 539–548. https://doi.org/10.1007/s10008-010-1112-4

Received: 28.02.2025
Accepted: 15.06.2025

DOI: https://doi.org/10.36719/2663-4619/119/89-95

**Javad Aliyev**
Azerbaijan State Oil and Industry University
PhD student
https://orcid.org/0009-0006-8505-9256
aliyev.javad@outlook.com

# Mechanism and Mitigation Strategies of Asphaltene, Resin and Paraffin Deposition in Oilfield Equipment

## Abstract

The article analyzes the existing technologies applied against asphaltene-resin-paraffin deposits (ARPD) formed in oilfield equipment and presents the results of scientific research conducted in the direction of developing more efficient methods to prevent these deposits. The formation of ARPD occurs due to the precipitation of paraffin, resin, asphaltenes and mechanical impurities present in crude oil onto the surfaces of equipment and pipelines as a result of changes in reservoir pressure and temperature. These deposits lead to a decrease in production, failure of technological equipment, shorter maintenance intervals and increased energy and material consumption. Since traditional methods such as cleaning with hot oil and steam are ineffective in deep wells, preference is given to chemical reagents, particularly paraffin deposition inhibitors and complex substances with depressor content. The article explains the composition and formation mechanism of ARPD, the role of surface-active components and analyzes the mechanism of action and advantages of chemical methods. As a result, it is shown that the development of new reagents based on synergistic principles is an effective and promising approach in combating ARPD.

***Keywords:*** *Asphaltene, resin, paraffin deposits, paraffin precipitation inhibitors, depressant, well bottom zone, annular space*

**Cavad Əliyev**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
doktorant
https://orcid.org/0009-0006-8505-9256
aliyev.javad@outlook.com

# Neft mədən avadanlıqlarında asfalten, qatran və parafin çöküntüsünün mexanizmi və zərərini azaltma strategiyaları

## Xülasə

Məqalədə neft-mədən avadanlıqlarında yaranan asfalten-qatran-parafin çöküntülərinə (AQPÇ) qarşı tətbiq edilən mövcud texnologiyalar təhlil olunur və bu çöküntülərin qarşısını almaq üçün daha səmərəli üsulların işlənməsi istiqamətində aparılan elmi-tədqiqat işlərinin nəticələri təqdim edilir. AQPÇ-lərin formalaşması lay təzyiqi və temperaturun dəyişməsi nəticəsində neftin tərkibindəki parafin, qatran, asfalten və mexaniki qarışıqların avadanlıq və boruların səthinə çökməsi ilə baş verir. Bu çöküntülər hasilatın azalmasına, texnoloji avadanlıqların sıradan çıxmasına, təmir müddətlərinin qısalmasına və əlavə enerji-maya sərfinə səbəb olur. Ənənəvi üsullar kimi isti neft və buxarla təmizləmə dərin quyularda effektli olmadığından, kimyəvi reagentlərə, xüsusilə parafinçökmə inhibitorları və depressor tərkibli kompleks maddələrə üstünlük verilir. Məqalədə AQPÇ-nin tərkibi, yaranma mexanizmi və səthi fəal komponentlərin rolu izah olunur, kimyəvi üsulların təsir mexanizmi və üstünlükləri analiz edilir. Nəticədə, sinergetik prinsiplərə əsaslanan yeni reagentlərin hazırlanmasının AQPÇ-yə qarşı mübarizədə effektiv və perspektivli yanaşma olduğu göstərilir.

***Açar sözlər:*** *asfalten, qatran, parafin çöküntüləri, parafinçökmə inhibitorları, depressor, quyudibi zona, həlqəvi fəza*

## Introduction

One of the main challenges during the operation of paraffinic oil wells is the methods for combating asphalt-resin-paraffin deposits (ARPD). ARPD absorbs onto the surfaces of downhole zones, subterranean equipment, and pipes as a result of temperature and pressure drops. They accumulate in the downhole zone, oil field equipment, and pipes, leading to decreased system productivity, reduced efficiency of pump units, and other negative consequences.

Along with paraffin, asphalt-resin particles also separate from the oil and deposit on these surfaces. It should be noted that currently, oil production departments mainly use hot oil, and sometimes steam, to clean lift pipes from ARPD in oil fields. To find more efficient methods for this purpose, it is essential to conduct numerous laboratory studies. For conducting targeted research, reviewing existing literature is required.

**Experiment:** Studies show that ARPD and salt deposition are affected by pressure and temperature in the formation and near-wellbore area. At high pressures (30–110 MPa) and temperatures (100–240 °C), the rock lithology influences deposition behavior: resins dominate in static conditions, while asphaltenes are more prominent in dynamic flow. The crystallization temperature of paraffins indicates their solubility and molecular characteristics (Kang, Lee, Lim 2014).

**Research**

A method for separating ARPD into major groups has been proposed. Temperature changes along the well closely follow the geothermal gradient (except in high-flow or water-cut wells). A 100 °C difference in paraffin crystallization onset implies that gas-rich crude forms ARPD less and at greater depths compared to oil with low gas content (Sousa, Matos, Guerreiro, 2019).

During production and transportation, asphaltic and paraffin masses adsorb onto rock surfaces, tubing, and equipment. Molecular diffusion is considered the main mechanism of wax deposition, though other processes (e.g., Brownian motion of solid paraffins) may contribute. Asphaltene deposition has been modeled under flow conditions through permeability tests, density analysis, pore structure studies, and soxhlet extraction. ARPD presents complex rheological, structural, chemical, and colloidal properties, further complicated by the wide variety of their compositions. Mostly organic, these deposits are insoluble and non-dispersible in crude oil under operating conditions. (Soto-Castruita, Ramrez, 2015).

Typically dark brown or black, ARPD is a solid mass with high viscosity, which decreases significantly with heat. Natural polar surfactants and oil emulsions concentrate within ARPD, enhancing their adhesion to metal surfaces and penetration into cracks, wear points, corrosion sites, and porous materials. These poorly soluble, dense substances tend to settle under gravity or centrifugal forces and interact with oil-rock, oil-metal, and oil-water interfaces (Huang, Zheng, & Fogler, 2015).

The properties of ARPD (Asphaltene-Resin-Paraffin Deposits) structural groups are not constant and vary depending on the nature of the petroleum products involved. Surface-active fractions extracted from asphalt–bitumen–fraction complexes (ABFC) exhibit higher surface activity than similar fractions obtained directly from crude oil. ARPD contains significantly more natural surfactants than oil itself, which strongly influences the colloid-chemical properties of the deposits.

Although asphaltenes have weak surface activity, they play a crucial role in stabilizing “water-in-oil” emulsions, along with resins, carbene–carbide compounds, and finely dispersed mineral particles. These compounds largely define the rheological and viscosity-related behavior of ARPD.

Surfactant concentrations in ARPD are extremely high—2–3 orders of magnitude above the critical micelle concentration (CMC). Most surfactants exist in free (molecular or colloidal) or bound states, not as micelles. When ARPD is diluted with cyclohexane (which breaks down high-

